# ŞƏKİ BƏLƏDİYYƏSİ

MƏN YANMASAM, SƏN YANMASAN, NECƏ ÇIXAR QARANLIQLAR AYDINLIĞA?!




Newspaper of SHEKI MUNICIPALITY

№ 01 (159), Yanvar 2018 | www.belediyye.sheki.city | Qəzet 2005-ci ildən nəşr edilir


## VƏTƏNİMİZİN QANLI TARİXİ

### İŞĞAL EDİLMİŞ TORPAQLARIMIZ

| | |
|---|---|
| QƏRBİ AZƏRBAYCAN | dekabr, 1988 |
| XANKƏNDİ | 26.12.1991 |
| XOCALI | 26.02.1992 |
| ŞUŞA | 08.05.1992 |
| LAÇIN | 18.05.1992 |
| XOCAVƏND | 02.10.1992 |
| KƏLBƏCƏR | 02.04.1993 |
| AĞDƏRƏ | 07.07.1993 |
| AĞDAM | 23.07.1993 |
| FÜZULİ | 23.08.1993 |
| CƏBRAYIL | 23.08.1993 |
| QUBADLI | 31.08.1993 |
| ZƏNGİLAN | 29.10.1993 |

**UNUTMAYAQ!**

## 20 YANVAR FACİƏSİNDƏN 28 İL KEÇDİ

# 2018 CÜMHURİYYƏT İLİ




# 20 Yanvar şəhidlərinin xatirəsi Şəkidə böyük ehtiramla anıldı



**Azərbaycan xalqının qan yaddaşına əbədi həkk olunmuş 20 Yanvar hadisələrindən 28 il ötür. Qanlı faciədən uzun illər keçməsinə baxmayaraq xalqımız o müdhiş gecəni daim xatırlayır, bu vəhşiliyi törədənlərə öz dərin nifrətini bildirir.**

Faciənin ildönümü ilə əlaqədar yanvarın 20-də Şəki şəhərindəki "Şəhidlər xiyabanı"nda şəhər rəhbərliyinin, ictimaiyyət nümayəndələrinin, müharibə və əmək veteranlarının iştirakı ilə ümumşəhər toplantısı keçirilib.

Tədbirdə çıxış edənlər Azərbaycan tarixinə Qanlı Yanvar kimi daxil olan bu faciənin xalqımızın qəhrəmanlıq salnaməsi, fəxarət və şərəf günü olduğunu vurğulalslar. Bildirildi ki, həmin faciəli günlərdə öz xalqının azadlığını, şərəf və ləyaqətini hər şeydən uca tutan mərd Vətən övladları canlarından keçərək şəhidlik zirvəsinə ucalıblar.

Çıxışlarda o da vurğulandı ki, 1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə Azərbaycan xalqına qarşı törədilmiş bu cinayət, tökülmüş nahaq qan, insanların vəhşicəsinə qətlə yetirilməsi xalqımızın müstəqillik uğrunda mübarizə əzmini qıra bilmədi. Azərbaycan xalqına qarşı törədilən bu qanlı cinayət xalq kütlələrini birləşdirib, onların mübarizliyini daha da artırdı.

Həmin gün şəhərimizin Cümə Məscidində şəhidlərin ruhuna dualar oxundu və saat 12.00-da rayonun bütün yaşayış məntəqələrində 20 Yanvar şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edildi.

Onu da qeyd edək ki, 20 Yanvar faciəsinin ildönümü ilə əlaqədar Şəki Şəhər İcra Hakimiyyəti tərəfindən şəhid ailələrinə maddi yardım göstərildi.

## TƏBRİK EDİRİK!

**Azərbaycan Respublikası Prezidentinin 2 fevral 2018-ci il tarixli Sərəncamı ilə Azərbaycanda Həmkarlar Hərəkatının inkişafındakı xidmətlərinə görə Azərbaycan bələdiyyə İşçiləri Həmkarlar İttifaqının Şəki rayon Komitəsinin sədri Səyyarə Əliyeva "Tərəqqi" medalı ilə təltif olunmuşdur.**



***Şəki Bələdiyyəsinin kollektivi, bütün şəkililər adından Səyyarə xanımı dövlətimizin yüksək mükafatına layiq görülməsi münasibəti ilə təbrik edir, ona möhkəm can sağlığı, gələcək fəaliyyətində daha böyük uğurlar arzulayır.***

# 2018-ci ilin Azərbaycan Respublikasında "Azərbaycan Xalq Cümhuriyyəti İli" elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin SƏRƏNCAMI



1918-ci il mayın 28-də Azərbaycan xalqının həyatında misilsiz hadisə baş vermiş, Müsəlman Şərqində ilk parlamentli respublika olan Azər-baycan Xalq Cümhuriyyəti qurulmuşdur. Cəmi iki ilə yaxın yaşamış Azərbaycan Xalq Cümhuriyyəti zəngin dövlət quruculuğu təcrübəsi ilə milli dövlətçilik tarixində silinməz izlər qoymuş, xalqın qəlbində azadlıq və istiqlal duyğularını gücləndirməklə respublikanın gələcək müstəqilliyi üçün etibarlı zəmin hazırlamışdır.

2018-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü tamam olur. Bu əlamətdar hadisənin dövlət səviyyəsində layiqincə qeyd edilməsi məqsədilə Azərbaycan Respublikası Prezidentinin "Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi haqqında" 2017-ci il 16 may tarixli 2867 nömrəli Sərəncamına əsasən, Azərbaycan Respublikasının Nazirlər Kabinetinə müvafiq tədbirlər planının hazırlanıb həyata keçirilməsi tapşırılmışdır. Bu tədbirlərlə yanaşı, Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü ilə əlaqədar ölkədə və ölkə xaricində silsilə tədbirlərin həyata keçirilməsi nəzərdə tutulmuşdur.

**Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq qərara alıram:**

***2018-ci il Azərbaycan Respublikasında "Azərbaycan Xalq Cümhuriyyəti İli" elan edilsin.***

**İlham Əliyev**
Azərbaycan Respublikasının Prezidenti
Bakı şəhəri, 10 yanvar 2018-ci il.

# Tarixçilərimizin 2018-ci ilin "Cümhuriyyət ili" elan edilməsinə münasibəti

***"Hər bir nəsil öz keçmişi haqqında aydın təsəvvürə malik olmalıdır. Azərbaycanda yeni nəsil müstəqil dövlətçilik, millətçilik ruhunu öyrənməli, bu ruh onun qanına, canına, vicdanına hopmalıdır. Tarix ancaq onu öyrənib imtahan vermək üçün deyil. Müsəlman Şərqində ilk demokratik cümhuriyyəti yaradan şəxsləri, onların yaratdığı ideologiyanı, məfkurəni yeni nəslə öyrətmək lazımdır. Prezident İlham Əliyevin 2018-ci ili "Azərbaycan Xalq Cümhuriyyəti ili" elan etməsi məhz buna xidmət edir".***

**Bu sözləri APA-ya açıqlamasında Bakı Dövlət Universitetinin (BDU) professoru, Məhəmməd Əmin Rəsulzadə irsinin tədqiqatçısı Şirməmməd Hüseynov deyib.**

Professor Azərbaycan dövlətinin Xalq Cümhuriyyətinin qurulmasının 100 illiyinə hazırlaşmasını yüksək qiymətləndirib: *"Dövlətin bu bayrama hazırlaşması çox yaxşıdır. Biri də var hər bir kollektiv, hər bir vətəndaş bu bayrama hazırlaşa. Novruz bayramını hər bir vətəndaş öz ailəsində qeyd edir. Bəs niyə müstəqil dövlətin elan olunduğu 28 may tarixini hərə öz ailəsində bayram kimi qeyd etməsin?! Bu günü bayram kimi qeyd etmək yox, məhz yaşamaq lazımdır. Üzeyir* ***bəy Hacıbəylinin məşhur sözü var:*** **"Bu vətən də bizimdir, bu millət də bizimdir, bu dövlət də bizimdir".** *Məhəmməd Əmin Rəsulzadə də eyni sözləri deyib.*

*(Davamı 4-cü səhifədə)*

# AZƏRBAYCAN RESPUBLİKASININ DAXİLİ İŞLƏR NAZİRLİYİ POLİS ORQANLARINDA VAKANT OLAN ORTA RƏİS HEYƏTİ VƏZİFƏLƏRİNƏ XİDMƏTƏ QƏBULLA ƏLAQƏDAR **MÜSABİQƏ ELAN EDİR**

**Respublikanın şəhər, rayon polis orqanlarında (Naxçıvan Muxtar Respublikası, Bakı, Sumqayıt şəhərləri və Abşeron rayonu istisna olmaqla) polis sahə rəisi, əməliyyat müvəkkili və yetkinlik yaşına çatmayanlarla profilaktiki işin təşkili üzrə inspektor vəzifələrinə xidmətə qəbul ilə əlaqədar müsabiqə keçirilir.**

Cəmi 100 vəzifənin komplektləşdirilməsi ilə əlaqədar keçirilən müsabiqə test imtahanlarından və müsahibədən ibarətdir. Test imtahanları - Azərbaycan Respublikasının daxili işlər orqanlarında xidmət keçmə haqqında Əsasnamə"nin tələblərinə cavab verən namizədlərə qanunvericilik aktları və nəzəri bilik sahələri üzrə test proqramı, eləcə də məntiqi nəticə çıxarmaq qabilliyyətini əhatə edən suallar üzrə Azərbaycan resublikasının Dövlət İmtahan Mərkəzi, müsahibə - test imtahanından müvəffəqiyyətlə keçmiş iştirakçılarla Daxili İşlər Nazirliyinin Mərkəzi Müsabiqə Komissiyası tərəfindən keçirilir.

Müsabiqədə Azərbaycan Respublikasının dövlət ali təhsil müəssisələrində hüquqşünas və müəllim (pedaqoq) ixtisası üzrə təhsil almış, yaşı 28-dən yuxarı olmayan, həqiqi hərbi xidmət müddətini tam başa vurmuş (kişilər üçün), özü və yaxın qohumları məhkum olunmamış, "Azərbaycan Respublikasının daxili işlər orqanlarında xidmət keçmə haqqında Əsasnamə"də müəyyən olunmuş şərtlərə cavab verən Azərbaycan Respublikasının vətəndaşları (daxili işlər orqanlarında xidmətə bərpa olunan və yaxud yenidən qəbul edilən orta və böyük rəis heyəti vəzifələrində işləmiş şəxslər istisna olmaqla) iştirak edə bilərlər.

Hacıqabul (1), Xaçmaz (1), Xızı (1), Qubadlı (1), Qusar (1), Saatlı (1), Sabirabad (1), Yardımlı (1) və Şirvan (1) şəhər, rayon polis şöbələrində vakant yetkinlik yaşına çatmayanlara profilaktiki işin təşkili üzrə



inspektor vəzifəsi üçün müsabiqədə yalnız göstərilmiş rayonlarda yaşayış yeri üzrə qeydiyyatda oan və azı 3 il pedaqoji staja malik şəxslər iştirak edə bilərlər.

Bakı, Sumqayıt şəhərlərində və Abşeron rayonunda (Naxçıvan Muxtar Respublikası istisna olmaqla), qeydiyyatda olan yalnız subay namizədlər respblikanın rayonlarında yaşayış şəraitləri nəzərə alınmaqla müsabiqəyə buraxılacaqlar.

Müsabiqə qaliblərinin təyinatı zamanı ilk növbədə həmin rayonda yaşayış şəraiti olanlara üstünlük veriləcək və təyinatlarından sonra onların xidməti iş yerləri Daxili İşlər Nazirliyinin Bakı, Sumqayıt şəhərlərində və Abşeron rayonunda yerləşən polis orqanlarına 5 il müddətində dəyişdirilməyəcəkdir.

Müsabiqədə iştirak etmək istəyən şəxslər http://www.mia.gov.az/index.php?/az/content/29799/ ünvanda yerləşdirilmiş elektron ərizə formasını şəxsən doldururaq elektron poçt vasitəsi ilə *bki@mia.gov.az* ünvanına Daxili İşlər Nazirliyinin Baş Kadrlar idarəsinə göndərməlidirlər.

**Elektron ərizənin Daxili İşlər Nazirliyinin Baş Kadrlar idarəsində qeydiyyata götürülməsi barədə elektron poçt vasitəsi ilə müvafiq məlumat aldıqdan sonra namizədlər yaşadıqları ərazi polis orqanlarına aşağıdakı sənədləri şəxsən təqdim etməlidirlər:**

***- şəxsiyyət vəsiqəsi;***
***- ali təhsil haqqında diplom;***
***- hərbi bilet (kişilər üçün);***
***- əmək kitabçası (olanlar üçün).***

Təqdim olunmuş sənədlər əsasında şəxsin müsabiqədə iştirakı üçün zəruri sənədləşmə aparılır.

Müsabiqədə iştirak edəcək şəxslərin sağlamlıq vəziyyəti və fiziki hazırlıq səviyyəsi daxili işlər orqanları əməkdaşları üçün müəyyən olunmuş normativlər üzrə yoxlanılır.

*"Daxili işlər orqanlarında xidmətə qəbul olunmaq üçün namizədlərlə müsabiqənin keçirilməsi Qaydaları"*, test imtahanının proqramları və fiziki hazırlıq üzrə ödəniləcək normativlər Daxili İşlər Nazirliyinin www.mia.gov.az ünvanlı Veb saytında yerləşdirilmişdir.

**Müsabiqədə iştirak etmək üçün sənədlər 2018-ci il yanvar ayının 22-dən fevral ayının 21-dək hər gün** (istirahət günləri istisna olmaqla) **saat 10-dan 17-dək şəhər, rayon polis orqanlarında qəbul olunur.**

**Əlavə məlumat almaq üçün əlaqə telefonları: *(012) 590-92-37; (012) 590-92-54; (012) 590-93-27; (012) 590-93-45; (012) 590-93-64; (012) 590-95-23.***

**DİN-in Baş Kadrlar İdarəsi**

# Şəki Bələdiyyəsi Cümhuriyyət İlini layiqincə keçirəcək



**Yanvarın 16-da Şəki Bələdiyyəsində Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 2018-ci ilin *"Azərbaycan Xalq Cümhuriyyəti İli"* elan edilməsi ilə əlaqədar yanvarın 10-da imzaladığı Sərəncamla bağlı iclas keçirildi.**

**Murad NƏBİBƏYOV**

Toplantını Şəki bələdiyyəsinin sədri **Elşad İbadov** açaraq dövlət başçısının Sərəncamının Azərbaycan xalqı üçün böyük önəm daşıdığını vurğuladı. O, bildirdi ki, ötən əsrin əvvəllərində Şərqin ilk demokratik respublikası olan Azərbaycan Cümhuriyyətinin 100 illik yubileyinin keçiriləcəyi 2018-ci il Azərbaycan tarixində ən yaddaqalan dövr olacaqdır. Natiq onu da bildirdi ki, Azərbaycan Cümhuriyyətinin yaradılmasında böyük rolu olan tarixi şəxsiyyətlərdən birinin - Fətəli Xan Xoyskinin həmyerlimiz olmasından bu gün bütün şəkililər qürur duyur.

Şəki Bələdiyyəsi sədrinin birinci müavini **İntiqam Əşirov** öz çıxışında bildirdi ki, Azərbaycan Respublikası Prezidentinin sonuncu - 10 yanvar tarixli sərəncamında o da qeyd olunmuşdur ki, Prezidentin "Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi haqqında" 2017-ci il 16 may tarixli Sərəncamına əsasən, Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü ilə əlaqədar ölkədə və ölkə xaricində silsilə tədbirlərin həyata keçirilməsi nəzərdə tutulmuşdur. Odur ki, həmin sərəncamda deyilənlər Şəki Bələdiyyəsi tərəfindən də layiqincə həyata keçiriləcək, Azərbaycan Cümhuriyyətinin 100 illik yubileyinin yüksək səviyyədə qeyd olunması üçün bütün imkanlardan istifadə olunacaqdır.

# "Yaşa, yaşa, çox yaşa, Azərbaycan!"

**Dilbər YAQUBOVA,**
*İ.S.Nakam adına mərkəzi kitabxana Abonement bölməsinin müdiri*

**Azərbaycan Respublikası Prezidentinin 10 yanvar 2018-ci il tarixli Sərəncamı ilə əlaqədar İ.S.Nakam adına mərkəzi kitabxanada Azərbaycan Cümhuriyyətinin banisi M.Ə.Rəsulzadənin doğum günü ərəfəsində *"Yaşa, yaşa, çox yaşa, Azərbaycan!"* adlı ədəbi-bədii kompozisiya keçirilib.**

Tədbirə şəhərimizin ziyalilari gənclər və kitabxanamizin əməkdaşları toplaşmışdılar. Tədbiri Xidmət və abonement şöbəsinin oxu zalının müdiri **Sadıqlı Yaqut** açdı. O, tədbir iştirakçılarını salamlayaraq respublikamızda bu il ***Azərbaycan Xalq Cümhuriyyət ili*** olduğunu qeyd etdi. Həmçinin onu da qeyd etdi ki, bu il ərzində mərkəzi kitabxanada silsilə tədbirlər keçiriləcək və bu tədbir həmin tədbirlərin başlanğıcıdır. Məhz ömrünü, həyatını, ailəsini müstəqillik yolunda qurban vermiş Məmmədəmin Rəsulzadənin ad gününə həsr edilməsi təsadüfi deyill. Bundan sonra o çıxış üçün sözü qocaman tarix müəllimi **Maqsud Məmmədova** verdi.

**Maqsud** müəllim geniş çıxış edərək 23 ay davam edən cümhuriyyət haqqında və bu gün onun davamçısı olan müasir müstəqillik haqqında danışdı.

Sonra Şəki Musavat partiyasının rəhbəri **Bakıxan Qəribli** çıxış üçün söz alaraq bu dövlət haqqında və onun qurucuları haqqında əhatəli şəkildə çıxış etdi. Ardınca Pedaqoji kollecin tarix müəllimi və Şəki qarışıq tipli internat məktəbinin direktor müavini **Pərviz Zeynalov**, filologiya üzrə fəlsəfə doktoru ADPU-nun Şəki filialının ədəbiyyat müəllimi **Kamil Adışirinov** öz mövqelərindən çıxış etdilər.

**K.Adışirinov,** ölərkən son nəfəsində belə 3 kərə Azərbaycan söyləyən insanın həyat yolu və bu yolda onun qazandıqları və itirdikləri haqda danışıldı.

Çıxışlar arasında videoçarxlara, "Azərbaycan Xalq Cümhuriyyəti-100" adlı sərgiyə baxış oldu və sonda xatirə şəkilləri çəkildi.









# "Vətən Şəhidləri ilə ucalır"



Rəşad Rüstəmov

**Nazilə QAFFAROVA,**
*M.F.Axundzadə ad. Şəki Mədəniyyət Mərkəzinin apancı metodisti*

**Yanvarın 19-da M.F.Axundzadə adına Şəki şəhər Mədəniyyət Mərkəzində 20 Yanvar faciəsinə həsr olunmuş "Vətən Şəhidləri ilə ucalır" adlı ədəbi-bədii kompozisiya keçirilmişdir.**

Tədbir Zeynəb Xanlarovanın ifasında "Şəhidlər" mahnısı sədaları altında başladı. İlk öncə şəhidlərin ruhu 1 dəqiqəlik sükutla yad edildi. Aparıcı **Rəşad Rüstəmovun** ifasında şəhidlərə aid bayatılar səsləndirildikdən sonra 20 Yanvar şəhidlərinə həsr olunmuş video çarx nümayiş etdirildi. Sonra 11 saylı tam orta məktəbin tarix müəllimi **Zaur Müslümov** qanlı faciə haqqında çıxış etdi. O çıxışında qeyd etdi ki, həmin gecə quduzlaşmış düşmən heç kimə aman vermirdi, qan su yerinə axırdı. Tank altında qalanların, gülləyə tuş gələnlərin hayı, harayı ərşə qədər çatırdı. Amma nə fayda ki, gözünü qan tutmuş cəlladlar bu hayı, harayı eşitmirdilər. Xalqa qənim kəsilənlər öz mənfur əməllərini məqsədyönlü şəkildə həyata keçirirdilər.

Daha sonra FHN-in Şəki Xilasetmə Taborunun əsgərləri **Allahverdi Eyvazov** və **Məhəmməd Əliyevin** ifasında *"Şəhid anası", "Vətən oğlu"* şeirləri, M.F.Axundzadə adına Şəki şəhər Mədəniyyət Mərkəzinin aparıcı metodisti **Nazilə Qaffarovanın** və Şəki Dövlət Regional Kollecin tələbələrinin ifasında isə şəhidlərə həsr olunmuş şeirlər və bayatılar səsləndirildi.

Tədbir Şəmistan Əlizamanlının ifasında *"And içirik"* mahnısının sədaları altında başa çatdı.

# AZƏRBAYCAN CÜMHURİYYƏTİ - 100

## Tarixçilərimizin prezidentin 2018-ci ili "Cümhuriyyət ili" elan etməsinə münasibəti



**Şirməmməd Hüseynov,** *Bakı Dövlət Universitetinin professoru, Məhəmməd Əmin Rəsulzadə irsinin tədqiqatçısı*



**Musa Qasımlı,** *tarix elmləri doktoru, professor, millət vəkili*



**Yaqub Mahmudov,** *Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutunun direktoru, akademik, millət vəkili*

*(Əvvəli 2-ci səhifədə)*

*Gərək hər kəs bunu bilə. Millət bilməlidir ki, bütün Azərbaycan onun vətənidir, onun mülküdür, onun əmələ gəldiyi və öləcəyi yerdir. Azərbaycan prezidenti sağ olsun ki, 2018-ci ili "Azərbaycan Xalq Cümhuriyyəti ili" elan edib. Amma hər bir ziyalı, hər bir vətəndaş da bu bayramı qeyd etməlidir. Mənim 94 yaşım var. 50 ildir bu bayrama hazırlaşıram".*

* * *

**Millət vəkili Musa Qasımlı** bildirib ki, prezident tərəfindən 2018-ci ilin "Cümhuriyyət ili" elan edilməsinin dərin mənası, böyük tarixi əhəmiyyəti var və bu, ictimaiyyətin ürəyindəndir: *"Məlumdur ki, 1918-ci il mayın 28-də xalqımız bütün müsəlman Şərqində ilk dəfə olaraq Cümhuriyyətin qurulduğunu elan etdi və demokratik bir dövlət qurdu. 23 ay mövcud olmasına baxmayaraq, Azərbaycan Cümhuriyyəti nəhəng tarixi əhəmiyyət daşıyan və gələcəkdə xalqımızın taleyinə ciddi təsir edə biləcək qanun və qərarlar qəbul etdi. Azərbaycan xalqı müsəlman xalqlarına müstəmləkəçilikdən xilas olmağın yolunu göstərdi, onlar üçün nümunə oldu. Avropanın bir çox ölkələrindən xeyli əvvəl qadınlara seçib-seçilmək hüququ verməklə, bütün dünya demokratiyasına böyük töhfə verdi. İşğal nəticəsində süquta uğrasa da, onun yerində Azərbaycan SSR quruldu. Uzun illər sonra Cümhuriyyətin bayrağı rəsmi olaraq ilk dəfə Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin rəhbərliyi altında Naxçıvan Muxtar Respublikası Ali Məclisi tərəfindən qəbul edildi. 1991-ci ildə Azərbaycan dövlətçiliyi bərpa edildi. Azərbaycan Respublikası Cümhuriyyətin varisi oldu".*

M. Qasımlı əlavə edib ki, cümhuriyyət tarixinin öyrənilməsi istiqamətində ilk addımlar ötən əsrin 80-ci illərinin sonlarında atılmağa başlandı: *"Lakin Cümhuriyyət tarixinin sistemli şəkildə araşdırılmasında Azərbaycan Xalq Cümhuriyyətinin 80 illiyi ilə bağlı olaraq Azərbaycan Respublikasının prezidenti Heydər Əliyevin 1998-ci ildə imzaladığı*




*"Azərbaycan Xalq Cümhuriyyətinin 80 illiyik yubileyinin keçirilməsi haqqında", "Azərbaycan Xalq Cümhuriyyətinin 80 illiyinə həsr olunmuş əsərlərin nəşr edilməsi haqqında" və "Azərbaycan Xalq Cümhuriyyətinin 80 illik yubileyinə həsr olunmuş ümumrespublika mərasiminin keçirilməsi haqqında" sərəncamları mühüm rol oynadı. Həmin sənədlərdə nəzərdə tutulmuş məsələlərin yerinə yetirilməsi nəticəsində Cümhuriyyət dövrü tarixinə həsr olunmuş ciddi, əhatəli və dərin elmi-tədqiqat işləri aparıldı, qiymətli əsərlər yazıldı, xarici siyasət sənədləri, Cümhuriyyət parlamentinin stenoqramları və b. nəşr edildi. Görülən işlər heç şübhəsiz, böyük əhəmiyyət daşısa da, tədqiq edilməsini gözləyən elmi-nəzəri problemlər hələ də qalmaqdadır. Bu baxımdan prezidentimiz İlham Əliyevin milli dövlətçilik tariximizə xüsusi qayğı və dərin hörmət əlaməti olaraq Cümhuriyyətin yubileyi haqqında 2017-ci il 16 may tarixində imzaladığı sərəncam böyük əhəmiyyət daşıyır. Tarixi-siyasi, ictimai, mənəvi əhəmiyyət daşıyan və bütövlükdə Cümhuriyyət dövrünün araşdırılmasında yeni səhifə açan bu sərəncam və 2018-ci ilin Cümhuriyyət ili çərçivəsində həyata keçiriləcək çoxsaylı tədbirlər xalqımızda, xüsusən gənclərimizdə müstəqil dövlətçilik və vətən sevgisi hisslərinin artırılmasında mühüm rol oynayacaq".*

* * *

**Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutunun direktoru, akademik Yaqub Mahmudov** 2018-ci ili "Azərbaycan Xalq Cümhuriyyəti ili" elan olunmasını yüksək qiymətləndirib. O qeyd edib ki, bu addım Milli Elmlər Akademiyasının Tarix İnstitutu tərəfindən böyük razılıqla qarşılanıb: *"Bu, Azərbaycan dövlətinin başçısının Cümhuriyyət tarixinə olan xüsusi ehtiramıdır. Hər il mayın 28-də Respublika Gününə həsr olunmuş qəbullar keçirən Azərbaycan prezidenti bütün çıxışlarında Cümhuriyyət tarixinə olduqca yüksək qiymət verir. Azərbaycan dövlətinin başçısı "İstiqlal Bəyannaməsi" abidəsini ucaltdırıb. Tarix İnstitutunun direktoru olaraq bəyan etmək istəyirəm ki, Azərbay-can dövlətinin başçısı Cümhu-riyyət tarixinin işlənməsi ilə əlaqədar mənə xüsusi tapşı-rıqlar verib. Cümhuriyyət tarixi-nin işlənməsini prezident şəxsi nəzarəti altında saxlayır. Ulu öndərimiz Heydər Əliyev Azərbaycan Xalq Cümhuriyyəti tarixinin araşdırılması məqsədilə bircildlik ensiklopedik lüğət hazırlamaq haqqında göstəriş vermişdi. Xüsusi ehtiramla bildirirəm ki, prezident İlham Əliyev isə ikicildlik ensiklopedik nəşrin çapı haqqında göstəriş verdi. Bu ensiklopediya ikinci dəfə də çap olundu. Hesab edirəm ki, bu ensiklopediya Cümhuriyyət tariximizə qoyulan çox böyük abidədir. Cənab prezident Tarix İnstitutuna qəti olaraq tapşırıb ki, Cümhuriyyət tarixi ilə bağlı araşdırmalar genişləndirilsin. Bu il biz Azərbaycan Xalq Cümhuriyyətinə həsr olunan beynəlxalq elmi konfrans keçirəcəyik. Tarix İnstitutu bu gün Elmi Şurasını keçirib. Bütün tarixçilərin adından prezident İlham Əliyevə minnətdarlıq məktubu göndəriləcək. Eyni zamanda qərar qəbul olundu ki, "Xalq Cümhuriyyətinin görkəmli dövlət xadimləri" adlı xüsusi kitab çap olunsun. Azərbaycan dövlətinin başçısının tarixi keçmişimizə, varisi olduğumuz Xalq Cümhuriyyətinə bu qədər önəm verməsini institutun bütün tarixçiləri adından alqışlayıram".*

---

**Şəki Şəhər İcra Hakimiyyəti başçısının sərəncamı ilə təsdiq edilmiş "20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümünün keçirilməsi ilə əlaqədar Şəki Şəhər İcra Hakimiyyətinin Tədbirlər Planı"na uyğun olaraq Şəkinin ümumtəhsil məktəblərində qanlı 20 Yanvar hadisələrinin ildönümü ilə bağlı tədbirlərin yüksək səviyyədə keçirilməsi məqsədilə Şəki Şəhər Təhsil Şöbəsinin müdiri tərəfindən əmr imzalanmış, tədbirlər planı təsdiq edilmişdir.**

# "20 Yanvar - Qan Yaddaşımız"



Təsdiq edilmiş tədbirlər planına uyğun olaraq 10 yanvar 2018-ci il tarixdən başlayaraq məktəblərdə silsilə tədbirlər, idman yarışları, şer və inşa yazı müsabiqələri, səhnəciklər, sərgilər təşkil edilmiş, keçirilən tədbirlərdə şagirdlərimizdə igid Vətən oğullarının qəhrəmanlıqlarından geniş bəhs olunmuşdur.

Qanlı 20 Yanvar hadisələrinin iyirmi səkkizinci ildönümünə həsr olunmuş Şəki Şəhər Təhsil Şöbəsinin yekun tədbiri - **"20 Yanvar - Qan Yaddaşımız"** adlı inşa yazı müsabiqəsi 18 yanvar 2018-ci il tarixdə Şəki şəhər 12 №-li tam orta məktəbdə Şəki Şəhər Gənclər və İdman İdarəsi ilə birgə keçirilmiş, müsabiqədə 30-dan artıq məktəbin şa-girdləri iştirak etmişdir.

**9 yanvar 2018-ci il tarixdə Şəkinin ümumtəhsil məktəblərində ilk dərs saatı 20 Yanvar hadisələrinə həsr edilmişdir.**

# Şəki Bələdiyyəsi 2017-ci ildə

## ŞƏKİ BƏLƏDİYYƏSİNİN ÖTƏN İL ÜZRƏ FƏALİYYƏTİNİN İLLİK HESABATI

**Yanvarın 22-də Şəki Bələdiyyəsinin 2017-ci ilin yekunlarına həsr edilmiş hesabat yığıncağı keçirilmişdir.**

Toplantıda Şəki Bələdiyyəsinin 2017-ci il ərzində büdcənin gəlir və xərclər maddələrinin yerinə yetirilməsinin icrası təhlil edilmiş və bu sahədə müsbət yönlü tədbirlər görülmüş, həmçinin görüləcək işlər müəyyənləşdirilmişdir.

**Şəki Bələdiyyəsi büdcəsinin gəlirləri barədə aşağıdakı məlumat verilmişdir:**

Bildirilmişdir ki, 2017-ci il ərzində fiziki şəxslərin torpaq və əmlak vergisi, tikinti altında olan torpaqların icarə haqları, avtomobil dayanacağı xidmətindən, reklam və mehmanxana xidmətindən, vətəndaşların mülkiyyətinə satılmış torpaq sahələrinə görə və sair sahələrdən daxil olan vəsaitlərin uçotunun qanunvericilikdə nəzərdə tutulmuş qaydada mühasibatlıqla yanaşı vergi yığım şöbəsi tərəfindən də aparılması təmin edilmişdir. Hesabat dövründə 19632 ədəd tədiyə bildirişi vergi ödəyicilərinin ünvanına çatdırılması üçün ərazilər üzrə xidmət göstərən vergi müfəttişlərinə verilmiş və onlardan 16746-sı ünvanına çatdırılmışdır.

2017-ci ildə bələdiyyə büdcəsinə cəmi 508886 manat vəsait daxil olmuşdur. Büdcə gəlirləri aşağıda göstərilən mənbələr hesabına formalaşmışdır: Torpaq vergisi (əhalidən) 16206 manat, əmlak vergisi (əhalidən) 27929 manat, torpaq vergisi qeyri-yaşayış sahələrindən (mağaza altı) 5786 manat, torpaq icarəsi qeyri-yaşayışs sahəsi üzrə (mağaza altı) 806 manat, əmlak vergisi qeyri-yaşayış sahəsi üzrə (mağaza) 5341 manat, torpaq icarəsi üzrə 3359 manat, torpaq satışından 408492 manat, mehmanxana rüsumu üzrə 2824 manat, reklam xidmətindən 4778 manat, avtodayanacaq xidmətindən 9275 manat, H.Əliyev adına parkdan daxil olan gəlir 6982 manat, "Şəki Bələdiyyəsi" qəzetinə verilən elanlardan 120 manat, dotasiya hesabına daxil olub16988 manat.

Bələdiyyə vergilərinin hesablanması və yığılması vəziyyəti, həmçinin büdcə daxilolmalarının təhlili göstərmişdir ki, 2017-ci il ərzində 16565 nəfər torpaq vergisinə cəlb olunmuş, 14382 nəfərə tədiyyə bildirişlərinin verilməsi təmin edilmiş, 3 nəfər güzəştlidir, 2183 nəfərə isə tədiyə bildirişinin çatdırılması təmin edilməmişdir. Müddət ərzində fiziki şəxslərdən torpaq vergisinin yığılması əvvəlki illərdən qalan borcla birlikdə 195284 manat təşkil etmişdir ki, faktiki 21992 manat vergi toplanması təmin edilmişdir.

Müddət ərzində fiziki şəxslərdən (əhalidən) torpaq vergisinin yığılması əvvəlki illərdən qalan borcla birlikdə 140146 manat, təşki edir ki, faktiki 16206 manat vergi daxil olmuşdur.

Həmçinin 2017-ci il ərzində fiziki şəxslərdən qeyri-yaşayış sahəsi (mağaza altı torpaq vergisi) üzrə torpaq vergisinə cəlb olunanların sayı 1092 nəfər olmuş, müddət ərzində 655 nəfərə tədiyyə bildirişlərinin verilməsi təmin edilmiş, 437 nəfərə isə tədiyə bildirişinin çatdırılması təmin edilməmişdir. Müddət ərzində fiziki şəxslərdən torpaq vergisinin yığılması qabaqkı illərdən qalan borcla birlikdə 55138 manat, təşki edir ki, faktiki 5786 manat vergi daxil olmuşdur.

Şəki Bələdiyyəsi üzrə 2017-ci il ərzində fiziki şəxslərdən əmlak vergisinə cəlb olunanların sayı 15618 nəfər olmuşdur.

Diqqətə çatdırılmışdır ki, vergi ödəyicilərindən 557 nəfər güzəştlidir. Müddət ərzində fiziki şəxslərdən əmlak vergisinin yığılması əvvəlki illərdən qalan borcla birlikdə 227885 manat, təşki edir ki, faktiki 33270 manat vergi daxil olmuşdur.

O cümlədən 2017-ci il ərzində fiziki şəxslərdən fərdi yaşayış evləri üzrə (əhalidən) əmlak vergisinə cəlb olunanların sayı 11459 nəfər olmuş və müddət ərzində 10759 nəfərə tədiyyə bildirişlərinin verilməsi təmin edilmişdir. Müddət ərzində fiziki şəxslərdən əmlak vergisinin yığılması əvvəlki illərdən qalan borcla birlikdə 198570 manat təşkil edir ki, faktiki 25831 manat vergi toplanmışdır. Məlumat üçün bildirilmişdir ki, vergi ödəyicilərindən 431 nəfər güzəştlidir.

2017-ci il ərzində fiziki şəxslərdən ictimai mənzillərin əmlak vergisinə cəlb olunanların ümumi sayı 2873 nəfər olmuş, müddət ərzində dürüstləşdirmə işləri aparılmaqla 2273 nəfərə tədiyyə bildirişlərinin verilməsi təmin edilmişdir. 2017-ci il üzrə fiziki şəxslərdən əmlak vergisinin yığılması əvvəlki illərdən qalan borcla birlikdə 15661 manat təşkil edir ki, faktiki 2098 manat vergi daxil olmuşdur. Güzəştli vergi ödəyicilərin sayı 126 nəfər olmuşdur.

Ötən il ərzində fiziki şəxslərin mülkiyyətində olan mağazalara görə əmlak vergisinə cəlb olunanların sayı mövcud siyahı ilə 1286 nəfər olmuş, müddət ərzində 746 nəfərə tədiyyə bildirişlərinin verilməsi təmin edilmişdir. 2017-ci il üzrə əmlak vergisinin yığılması əvvəlki illərdən qalan borcla birlikdə 13654 manat təşki edir ki, faktiki 5341 manat vergi daxil olmuşdur.

Hesabat dövründə torpaq satışından 409000 manat vəsaitin daxil olması nəzərdə tutulduğu halda faktiki 408492 manat vəsait daxil olmuşdur ki, bu da nəzərdə tutulandan 508 manat azdır.

İclasda o da bildirilmişdir ki, hesabat dövründə torpaq icarəsindən 4165 manat, reklam rüsumundan 10000 manata qarşı faktiki 4778 manat vəsait daxil olmuşdur ki, bu da reklam istifadəçilərinin maliyyə sıxıntısının olması səbəbdən nəzərdə tutulduğundan 5222 manat az olmuşdur. Avtodayanacaq rüsumundan daxil olan vəsait 12000 manata qarşı faktiki 9275 manat olmaqla nəzərdə tutulduğundan 2725 manat az olmuşdur. Mehmanxana rüsumundan daxil olan vəsait 2000 manata qarşı faktiki 2824 manat olmaqla nəzərdə tutulduğundan 824 manat çox olmuşdur. Hesabat dövründə dotasiya hesabına daxil olan vəsait 15000 manata qarşı 16998 manat olmaqla, nəzərdə tutulduğundan 1998 manat çox olmuşdur. H.Əliyev adına parkdan daxil olan vəsait 6982 manat olmaqla, nəzərdə tutulduğundan 8518 manat az olmuşdur. 2017-ci il ərzində digər daxilolmalar - fiziki və hüquqi şəxslərdən maliyyə yardımı və sair daxil olmalar üzrə hesabına 1000 manat vəsaitin daxil olması nəzərdə tutulsa da faktiki 120 manat daxil olmuşdur.



Beləliklə, 2017-ci ildə faktiki olaraq büdcə gəlirləri 508886 manat olmaqla, nəzərdə tutulduğundan 21114 manat az olmuşdur.

**Şəki Bələdiyyəsi büdcəsinin xərcləri barədə aşağıdakı məlumat verilmişdir:**

- Bələdiyyə aparatının saxlanması xərcləri: 294489 manat (o cümlədən, əmək haqqı 149821 manat, vergi ödənişi 13365 manat, həmkarlar təşkilatının üzvlük haqqı 3579 manat, aliment 3129 manat, YAP-a üzvlük haqqı 123 manat, Silahlı Qüvvələrə 1411 manat, Qızıl Aypara Cəmiyyətinə 53 manat, işçilərin kreditor borcu 3174 manat, DSMF-na 49205 manat, birdəfəlik müavinət 2750 manat, ümumi təsərrüfat xərcləri 10345 manat, ezamiyyə xərcləri 11280 manat, yanacaq, sürtgü materialları, ehtiyat hissələri və təmir xərcləri 11372 manat, rabitə xidməti haqqı 8124 manat, elektrik enerjisi haqqı 9935 manat, su-kanalizasiya haqqı 1112 manat, inventar və avadanlıq 605 manat, sair xərclər 15106 manat (o cümlədən, bayram münasibəti ilə işçilərə ödənilən vəsait 7730 manat, mühafizə 4200 manat, maşınların sığorta xərci 323 manat, əlillərin əmək haqqı kartə xərci 510 manat, digər xərclər 2343 manat), digər təyinatlı xərclər 213847 manat (o cümlədən imkansız ailələrə maddi yardım 7145 manat, mədəni Kütləvi tədbirlərə 25718 manat, abadlıq işlərinə 106786 manat, reyestr, katastr, hərrac və torpaq sahələrinin planlaşdırılması xərci 51371 manat, bank xidməti və nəğd alınmış vəsait üçün 1 % - 5279 manat, assosasiya 2800 manat, auidit 5000 manat, kreditor borcların ödənilməsinə 2300 manat, digər xərclər 7448 manat) təşkil etmişdir. Beləliklə, 2017-ci il üçün Şəki Bələdiyyəsi büdcəsinin xərclər maddəsində nəzərdə tutulmuş 530000 manat vəsaitə qarşı faktiki olaraq 508336 manat xərclənmişdir.

* * *

Diqqətə çatdırılmışdır ki, hesabat dövründə yanvar, fevral, mart aylarında bələdiyyə tərəfindən şəhərin müxtəlif küçələri qum və duzdan istifadə olunaraq qar və buzdan təmizlənmişdir. Həmçinin Şəki şəhər 9 saylı məktəbin saninar qovşağında təmir-bərpa işləri görülmüş, şəhərin yeni yaşayış massivindəki 104, 119, 120 və 121-ci kvartallarında abadlıq işləri görülmüşdür.

* * *

Ümumi yığıncaqda məlumat verilmişdir ki, 2017-ci il ərzində Şəki Bələdiyyəsi tərəfindən fərdi yaşayış evi tikintisi üçün 208 nəfərə 11, 66 hektar torpaq sahəsi ayrılmışdır. Torpaq sahəsi alanların iki nəfəri şəhid ailəsinin üzvü və dörd nəfəri Qarabağ müharibəsi əlili olduğu üçün, onlara torpaq sahəsi pulsuz verilmişdir. Eyni zamanda, hesabat dövründə bir nəfər şəhid ailəsi üzvü olmaqla 10 nəfərə sahibkarlıq fəaliyyəti ilə məşğul olmaq üçün müsabiqə qaydasında 0,203 hektar torpaq sahəsi satılmışdır.

* * *

Hesabat yığıncağında diqqətə çatdırılmışdır ki, 2017-ci ildə Şəki Bələdiyyəsi üzvlərinin 17 iclası keçirilmiş, bələdiyyənin səlahiyyətinə aid olan 118 məsələyə baxılmışdır.

Həmçinin bildirilmişdir ki, diqqətə çatdırılmışdır ki, 2017-ci ildə Şəki Bələdiyyəsinə 568 ərizə və müraciət daxil olmuşdur. Onlardan 296 ərizə fərdi yaşayış evinin tikintisi üçün torpaq sahəsinin ayrılmasına, 110 müraciət maddi yardım göstərilməsinə, 28 ərizə qərarsız istifadə etdikləri torpaq sahəsinin sənədləşdirilməsinə, 35 müraciət şəhərin müxtəlif ünvanlarında, yaşayış evlərinə, elektrik naqillərinə təhlükə yaradan ağacların budanması və ya kəsilməsinə, 99 müraciət isə sahibkarlıq fəaliyyəti ilə əlaqəli torpaq sahəsinin ayrılmasına, təmir, abadlıq və digər məsələlərə aid olmuşdur.

Eyni zamanda, hesabat dövründə Şəki Bələdiyyəsinə idarə, müəssisə və təşkilatlardan 372 məktub daxil olmuşdur. Onların hamısı vaxtında qeydiyyata alınmış, icraata çatdırılmış, onlara vaxtında və əsaslandırılmış cavablar verilməsi təmin edilmişdir.

Həmişə olduğu kimi, 2017-ci ildə də Şəki Bələdiyyəsində vətəndaşların qəbuluna xüsusi diqqət yetirilmiş, onların ərizə və şikayətlərinə baxılması operativ və obyektiv həyata keçirilmişdir. Bununla əlaqədar bələdiyyə sədri və müavinlərinin qəbul günləri müəyyən edilmişdir.

Ötən il bələdiyyə sədri və müavinlərinin qəbulunda 448 nəfər olmuşdur. Müraciətlər əsasən maddi vəziyyətin yaxşılaşdırılması, torpaq sahəsinin ayrılması, küçə və yolların təmiri, işıq, qaz, su təchizatının yaxşılaşdırılması ilə bağlı olmuşdur.

İclasda o da vurğulanmışdır ki, Respublikamızın hər yerində olduğu kimi, Şəki Bələdiyyəsi də oktyabrın 30-dan noyabrın 5-dək "Demokratiya həftəsi" keçirmişdir. Həftəyə hazırlıq işləri ərəfəsində bələdiyyənin inzibati binasının qarşısında ""Azərbaycanda Yerli Demokratiya həf-təsi"ndə fəal tştirak edək!", "Bələdiyyə-vətəndaş yaxınlığı zamanın tələbidir!" sözləri yazılmış plakatlar yerləşdirilmiş, binanın birinci mərtəbəsində sakinlərin müraciətləri üçün xüsusi qutu qoyulmuşdur. Həmçinin Şəki əhalisinin "Azərbaycanda Demokratiya Həftəsi"nin keçirilməsi barədə məlumatlandırılması məqsədi ilə şəhərin müxtəlif məhəllələrində müvafiq yerlərə elanlar yapışdırılmışdır.

Eyni zamanda, şəhər əhalisinin bələdiyyəyə müraciət etməsi üçün Qaynar xətt telefonundan (244-00-51) istifadə edilmişdir.

Bütün bu sadaladıqlarımız həm də "Şəki Bələdiyyəsi" qəzetinin 2017-ci il, sentyabr və noyabr tarixli 9-10-cu saylarında dərc edilmişdir.

Gərgin keçən həftə ərzində Şəki Bələdiyyəsində şəhər sakinləri - ziyalılar, idarə və təşkilat rəhbərləri, ictimaiyyət numayəndələri ilə 6 dəfə görüş keçirilmiş, bu görüşlərdə bələdiyyənin gördüyü işlər barədə məlumat verilmiş və görüş iştirakçılarının şikayət və təklifləri dinlənilmişdir. Sözügedən görüşlərdə ümumilikdə 1312 nəfər şəhər sakini iştirak etmişdir.

Bunlardan başqa həftə ərzində Şəki Bələdiyyəsinin rəhbərliyi tərəfindən fərdi şəkildə 248 nəfər şəhər sakini qəbul edilmiş, onların müraciətlərinə operativ şəkildə baxılmışdır.

Şəki Bələdiyyəsi vətəndaşlardan daxil olan ərizə və şikayətlərə baxılması, şifahi müraciətlərin dinlənilməsi məsələsini də daim diqqət mərkəzində saxlamışdır. Belə ki, bələdiyyədə seçiciləri narahat edən problemlər müntəzəm öyrənilmiş, vətəndaşların müraciətlərində irəli sürülən təkliflər, tənqidi qeydlər təhlil olunmuş və müvafiq tədbirlər görülmüşdür.

Şəki Bələdiyyəsi bundan sonra da vətəndaşları yerli özünüidarə prosesinə cəlb etməkdə, qarşıya çıxan problem və nöqsanları aradan qaldırmaq üçün potensialı səfərbər edəcək, yerli problemlərin həllində öhdəsinə düşən vəzifələri layiqincə yerinə yetirəcəkdir.

# Şəki statistikanın gözü ilə



## Şəki şəhər Qarışıq tipli Uşaq evi

**Yeganə QAFFAROVA**
*Statistika İdarəsinin baş məsləhətçisi*

**Uşaqlar və onlara qayğı daim dövlətin diqqət mərkəzindədir. Kimsəsiz və valideyn himayəsindən məhrum olmuş uşaqlar, uşaq evləri və internet məktəblərində saxlanılır, onlara qayğı göstərilir, təhsil almalarına şərait yaradılır.**

"Uşaq evləri və internat məktəblərinin inkişafı" Proqramı çərçivəsində respublika üzrə 30-dan çox uşaq müəssisəsi əsaslı şəkildə təmir edilmiş, yeni avadanlıqla təchiz olunmuş, əlavə yardımçı binalar inşa edilmiş və kommunal şərait yaxşılaşdırılmışdır. Müəssisələrdə kitabxanalar yaradılmış, onlar müvafiq tədris vəsaiti və bədii ədəbiyyatla təmin olunmuş, əksər uşaq evləri və internat məktəblərində kompyuter avadanlığı quraşdırılmışdır. Sinif otaqları interaktiv təhsil üçün uyğunlaşdırılmışdır. Uşaqların hərtərəfli inkişafı üçün müvafiq şəraitin yaradılması məqsədi ilə uşaq evləri, o cümlədən rayonumuzdakı Qarışıq tipli Uşaq evi daim dövlətin diqqət mərkəzində saxlanılır.

1936-cı ildən yaradılmış və hazırda ümumi yerlərin sayı 105 olan və 61 nəfəri əhatə edən Şəki qarışıq tipli uşaq evində 42 nəfər uşçi çalışır vardır, o cümlədən 18 nəfər pedaqoji işçi çalışır. Bu uşaq evində 2017-ci ildə gələn uşaqların sayı 21 nəfər olmuş, 5 nəfər uşaq qəyyumluğa götürülmüş, 5 nəfəri isə valideynlərinə qaytarılmışdır. 61 nəfər uşaqdan 52 nəfər uşaq 6 yaşdan yuxarı yaşda olub, təhsil alanlardır.

Respublikada, o cümlədən, rayonda fəaliyyət göstərən uşaq evləri və internat məktəblərində mövcud problemlərin araşdırılması məqsədi ilə monitorinq aparmış, bu müəssisələrdə uşaqların sayı, aylıq və illik dövlət təminatına daxil olan qida, geyim, texniki vəsait normativləri, ümumi şərait (təhsil, səhiyyə, yaşayış, istirahət) kimi göstəriciləri müəyyən edilmişdir. Araşdırmadan sonra uşaq evlərinə və internatlara texniki dəstək, təhsil və səhiyyənin inkişafına kömək əsas istiqamətlər kimi önə çəkilmişdir. Bu müəssisənin maddi texniki bazasının möhkəmləndirilməsinə mühüm yer verilir. Müəssisə yeməkxana, emalatxana, idman zalı, kompüter otaqları ilə təmin olunmuşdur.

Uşaq evləri və internat məktəblərində tərbiyə alan yeniyetmələrə vətənpərvərlik hissinin aşılanması, onların istirahətinin və asudə vaxtlarının səmərəli təşkili məqsədi ilə 1800-ə yaxın nüsxə kitab və jurnallar vardır. Bu məqsədlə Heydər Əliyev Fondu ardıcıl olaraq kütləvi tədbirlər, müsabiqələr keçirir, müəssisələrə, uşaq evlərinə lazım olan köməyi əsirgəmir. Fəaliyyət göstərdiyi dövr ərzində Fondun himayə etdiyi bütün uşaq evləri, o cümlədən rayonumuzdakı uşaq evi zəruri vəsaitlərlə təmin edilmişdir.

Uşaq evlərinə "Valideynlərini itirmiş və valideyn himayəsindən məhrum olmuş uşaqların sosial mudafiəsi haqqında" qanununa uyğun olaraq, valideynlərini itirmiş və ya valideyn himayəsindən məhrum olmuş 3 yaşdan yuxarı uşaqlar qəbul edilirlər.

Uşağın mənafeyinin tələb etdiyi hallar istisna olmaqla, qardaş və bacıların ayrılmasına yol verilmir. Uşaq evinə qəbul zamanı qohumluq əlaqəsi olan uşaqlara üstünlük verilir.

Eyni zamanda 18 yaşı tamam olduqda (ali və orta peşə-ixtisas təhsili müəssisələrində əyani formada təhsil alan şəxslər təhsilini bitirdikdə (23 yaşdan çox olmamaqla) və əmək fəaliyyətinə başladıqda yaşayış sahəsi yoxdursa, ayrı-ayrı yataq otaqlarında yerləşdirilir.

2017-ci ildə uşaq evinin saxlanması üçün dövlət büdcəsindən 227.4 min manat vəsait ayrılmışdır. Bu da əvvəlki ildən 18,2 min manat şoxdur.

Şəkidə fəaliyyət göstərən qarışıq tipli uşaq evinin işçi kollektivi yetim və valideyn himayəsindən məhrum olan uşaq və yeniyetmələrin təlim tərbiyəsini, maddi-məişət şəraitini və sosial müdafiəsini daha yaxşı təmin etməyə çalışır.

**Rayonda uşaq evində tərbiyə olunanların yaş tərkibinə görə bölgüsü** *(nəfər)*.

| | Uşaq evində tərbiyə olunanların sayı | Yetim uşaqlar | Qızlar | Təhsil alanlar | Təhsil almayanlar |
|---|---|---|---|---|---|
| **C Ə M İ:** | 61 | 8 | 19 | 52 | 9 |
| 2 yaşa qədər | - | - | - | - | - |
| 3 yaşda | 2 | - | - | - | 2 |
| 4 yaşda | 1 | - | - | - | 1 |
| 5 yaşda | 3 | - | 1 | - | 3 |
| 6 yaşda | 2 | - | - | 2 | 2 |
| 7 yaşda | 4 | - | 2 | 2 | - |
| 8 yaşda | 5 | - | 2 | 5 | - |
| 9 yaşda | 9 | 1 | 1 | 9 | - |
| 10 yaşda | 6 | - | 2 | 6 | - |
| 11 yaşda | 7 | 1 | 2 | 7 | - |
| 12 yaşda | 3 | - | 1 | 3 | - |
| 13 yaşda | 5 | 2 | 3 | 5 | - |
| 14 yaşda | 5 | 1 | - | 5 | - |
| 15 yaşda | 1 | - | 1 | 1 | - |
| 16 yaşda | 3 | 1 | 1 | 2 | 1 |
| 17 yaşda | 3 | 1 | 2 | 2 | 1 |
| 18 yaşda | 2 | 1 | 1 | 1 | - |



## Heyvandarlığın inkişaf tempi

**Yeganə İLYASOVA,**
*Statistika İdarəsinin aparıcı məsləhətçisi*

**"Ölkənin sosial-iqtisadi həyatında xüsusi əhəmiyyət kəsb etdiyi üçün qeyri-neft sektorunun prioritet sahələrindən olan kənd təsərrüfatı məhsullarının istehsalı və emalı sektoru ötən dövr ərzində iqtisadiyyatın əsas sektorlarından biri kimi müəyyənləşdirilmiş və görülmüş məqsədyönlü tədbirlər nəticəsində Azərbaycanda bu sektorun inkişafı üçün əlverişli şərait yaradılmışdır".**

**İlham Əliyev**
Azərbaycan Respublikasının Prezidenti

İqtisadiyyatın səmərəliliyinin artırılması və rəqabət qabiliyyətinin yüksəldilməsi istiqamətində qeyri-neft sektorunun inkişafının təmin edilməsi dövlətimizin əsas iqtisadi prioritetlərindəndir. Bu məqsədlə ölkədə aparılan uğurlu iqtisadi siyasət nəticəsində iqtisadiyyatın diversifikasiyasına nail olunması ilə yanaşı, qeyri-neft sektorunun da ümumi daxili məhsulda xüsusi çəkisi nəzərə çarpacaq dərəcədə artmışdır.

Ölkənin sosial-iqtisadi həyatında xüsusi əhəmiyyət kəsb etdiyi üçün qeyri-neft sektorunun prioritet sahələrindən olan kənd təsərrüfatı məhsullarının istehsalı və emalı sektoru ötən dövr ərzində iqtisadiyyatın əsas sektorlarından biri kimi müəyyənləşdirilmiş və görülmüş məqsədyönlü tədbirlər nəticəsində Azərbaycanda bu sektorun inkişafı üçün əlverişli şərait yaradılmışdır.

**Doğma respublikamızın iqtisadiyyatı dinamik şəkildə inkişafdadır. Respublikamızın iqtisadiyyatının yüksəlişində Şəki rayonunun öz payı vardır.**

Rayonda kənd təsərrüfatı məhsulları istehsalını artırmaq üçün daxili imkanlar çoxdur və bundan bacarıqla istifadə olunur.

**Şəki rayonunun kənd əhalisi əsasən bitkiçilik və heyvandarlıqla məşğul olur.**

Dövlət Statistika Komitəsinin 2011-ci il 06 iyul tarixili 23/11 nömrəli sərəncamı ilə təsdiq edilmiş təşkilat planına uyğun olaraq 2018-ci il yanvarın 1-i vəziyyətinə rayon ərazisində malqara və quşların tam uçotu keçirilmişdir.

Toplanmış hesabatların təhlili göstərir ki,mal-qaranın baş sayı 01 yanvar 2017-ci ilin yekunlarına nisbətən artmışdır. Rayonda mövcud olan mal-qaranın vəziyyəti ötən ilin müvafiq dövrü ilə müqayisədə öz əksini yuxprıdakı cədvəldə tapmışdır.

Həmin *(1 yanvar 2018-cı il vəziyyətinə cəmi rayon üzrə mal-qara və quşların baş sayı)* cədvəldən göründüyü kimi rayon üzrə iri buynuzlu mal-qaranın baş sayı əvvəlki ilin müvafiq dövrünə nisbətən 304 baş yəni, 0,4 faiz,o cümlədən ana inək və camışların sayı 225 baş yəni, 0,6 faiz , qoyun və keçilərin baş sayı 14675 baş yəni, 4,9 faiz, quşların baş sayı 4080 baş yəni, 1,5 faiz, arı ailələri 21 yeşik yəni 0,4 faiz artmış, atların baş sayı 225 baş və ya 9.7 faiz, ulaqların baş sayı isə 170 baş və ya12,7 faiz azalmışdır.

**1 yanvar 2018-cı il vəziyyətinə cəmi rayon üzrə mal-qara və quşların baş sayı**

| S.s | | 01.01. 2018-ci il | 01.01.2017-ci il | 01.01. 2018-ci il 01.01. 2017-ci ilə nisbətən, (faizlə) |
|---|---|---|---|---|
| 1 | İribuynuzlu mal-qara | 71508 | 71204 | 100,4 |
| 2 | **o cümlədən** inək və camışlar | 35921 | 35696 | 100,6 |
| 3 | Qoyun və keçi | 313372 | 298697 | 104,9 |
| 4 | Bütün növ quşlar | 278950 | 274870 | 101,5 |
| 5 | Arı ailələri | 5395 | 5374 | 100,4 |
| 5 | Atlar | 2084 | 2309 | 90,3 |
| 7 | Ulaqlar | 1164 | 1334 | 87,3 |

2017-cı ildə rayon üzrə cəmi 10553 ton diri çəkidə ət, 58255 ton süd, 26106 min ədəd yumurta, 467,2 ton yun istehsalı olmuşdur ki, bu da əvvəlki ilin müvafiq dövrünə nisbətən ət 153 ton, süd 1415 ton, yumurta 636 min ədəd, yun isə 6,7 ton çoxdur. İstehsal olunmuş ətin 99,9 faizi,və ya 10547 tonu, südün 93,6 faizi 54552 tonu, yunun 98,9 faizi, və ya 462,0 tonu, yumurtanın isə hamısı sahibkarlıq, ailə kəndli ev təsərrüfatlarının payına düşür.

**1 yanvar 2018-ci il vəziyyətinə cəmi rayon üzrə heyvandarlıq məhsullarının həcmi**

| | Ölçü vahidi | 01.01. 2017- ci il | 01.01.2016-cı il | Fərq (+ -) |
|---|---|---|---|---|
| **Rayon üzrə cəmi** | | | | |
| **Ət** | ton | 10553 | 10400 | +153 |
| **S ü d** | -"- | 58255 | 56840 | +1415 |
| **Yumurta** | min ədəd | 26106 | 25470 | +636 |
| **Y u n** | ton | 467,2 | 460,5 | +6,7 |

**Bu il kənd təsərrüfatının inkişafında uğurlu il olmuşdur. Biz artıma nail ola bildik. 2019-cu ildə də bu artım hesab edirəm ki, daha da böyük rəqəmlərlə ölçüləcəkdir.**

**Biz əminik ki fədakar kənd zəhmətkeşləri torpağa möhkəm bağlanaraq öz əmәkləri ilə daha böyük nailiyyətlərə imza atacaqlar.**

# "20 Yanvar əbədi yaddaşımızdır"

**Şəmsiyyət Əsgərova,**
*Şəki şəhər 3 saylı Uşaq Musiqi Məktəbinin direktoru*

**Yanvarın 19-da Şəki şəhər 3 saylı Uşaq Musiqi Məktəbində 20 Yanvar faciəsinə həsr olunmuş *"20 yanvar - əbədi yaddaşımızdır"* mövzusunda anım tədbiri keçirilmişdir.**

Tədbirdə məktəbin müəllimləri, şagirdləri və valideyinlər iştirak etiblər. Əvvəlcə şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Məktəblilər 20 yanvar şəhidlərinə həsr olunmuş və vətənpərvərlik ruhunda yazılmış digər qəhrəmanlıq şeirləri səsləndiriblər.

Sonra məktəbin direktoru **Şəmsiyyət Əsgərova**, məktəbin müəllimləri **Nəzakət Məmmədova**, **Şəfa Abdullayeva**, **Zəminə Məmmədova** və **Rəna İsgən-dərova** çıxış ediblər. Bildirilib ki, Azərbaycan xalqının tarixinə Qanlı Yanvar faciəsi kimi daxil olmuş 1990-cı il 20 Yanvar hadisələrindən 28 il keçir. Bu faciə insanlığa qarşı törədilmiş ən ağır cinayətlərdən biri kimi bəşər tarixində qara səhifə olaraq qalacaqdır. Sonda 20 Yanvar hadisələrinə dair videoçarx nümayiş etdirilib.




## 20 Yanvar faciəsinin iyirmi səkkizinci ildönümü ilə əlaqədar Şəkidə müxtəlif idman yarışları keçirilib.

**Qanlı Yanvar hadisələrinin ildönümü ilə əlaqədar yanvarın 17-də Şəki şəhər 20 №-li tam orta məktəbin idman zalında Şəki Şəhər Uşaq-Gənclər İdman-Şahmat Məktəbinin təşkilatçılığı ilə məktəblilər arasında voleybol turnirinin açılış mərasimi olmuşdur.**



Tədbirdə əvvəl Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilmiş və şəhidlərimizin ruhu bir dəqiqəlik sükutla yad edilmişdir. Tədbiri Şəki Şəhər Uşaq-Gənclər İdman-Şahmat Məktəbinin məşqçi-müəllimi **Murad Abdurahmanzadə** açmış, yarışın əsasnamə və keçirilmə qaydaları barədə yarış iştirakçılarına məlumat vermişdir. Sonra Şəki Şəhər Uşaq-Gənclər İdman-Şahmat Məktəbinin direktoru **Hətəm Vəliyev** çıxış edərək rəhbərlik etdiyi məktəbin idmançı şagirdlərinin həm rayon, həm respublika və həm də dünyamiqyaslı yarışlarda uğurlu çıxışlarından söz açmış, əldə olunmuş uğurlardan geniş danışmışdır. Şəki Şəhər Təhsil Şöbəsinin nümayəndəsi **Anar Məmmədov** çıxış edərək əvvəlcə tədbir iştirakçılarına Şəki Şəhər Təhsil Şöbəsinin müdiri Südabər İsmayılovanın salamlarını çatdırmış, Qanlı 20 Yanvar hadisələrinin iyirmi səkkizinci ildönümünə ilə əlaqədar Şəkinin ümumtəhsil məktəblərində keçirilən tədbirlərdən söz açmış, idman yarışlarının əhəmiyyətini xüsusi qeyd etmişdir.

Sonra tədbir iştirakçıları yarışın açılış oyununu maraqla izləmişlər. Yarışlar üç gün davam etmişdir.

# TEYMURXAN ŞÖVKƏT-ZİYA OĞLU ŞAMİLOV



***1999-cu ildə Azərbaycanda yeni yaradılmış özünüidarəetmə orqanlarına - bələdiyyələrə ilk seçkilər keçiriləndə Teymurxan Şamilov Şəki Bələdiyyəsinə üzv seçilmiş və bələdiyyə üzvlərinin ilk iclasında yekdilliklə bələdiyyənin sədri vəzifəsinə layiq görülmüşdür.***

**Şəki Bələdiyyəsinin ilk və sabiq sədri Teymurxan Şövkət-Ziya oğlu Şamilov yanvarın 22-də Bakı şəhərində dünyasını dəyişmişdir.**

**Şamilov Teymurxan Şövkət-Ziya oğlu 1950-ci də Şəkidə anadan olmuşdur.** Orta təhsilini Şəkidə aldıqdan sonra, Azərbaycan Politexnik İnstitutunun Mexanika fakültəsini bitirib, 1972-ci ildə toxuculuq sənayesinin maşın və aparatları üzrə mühəndis-mexanik ixtisasına yiyələnmiş və həmin il 6-cı dərəcəli usta köməkçisi kimi Mingəçevir Şüşə Liflər Zavodunda əmək fəaliyyətinə başlamışdır. Bir il həmin zavodda işlədikdən sonra doğma Şəkiyə qayıtmış və 1976-cı ilədək Şəki Sənaye Kombinatının Kəlağayı sexində mexanik vəzifəsinə işə düzəlmişdir. Sonralar Teymurxan Şamilov - 1976-79-cu illərdə Şəki İpək İstehsalat Birliyinin baramaaçan istehsal sahəsində usta köməkçisi və avtomat dəzgahlar üzrə briqadir, 1979-81-ci illərdə Bakı şəhərində Bədii Hədiyyələr Fabrikində briqadir, 1981-82-ci illərdə "Azərxalça" İstehsalat Birliyində mühəndis, 1982-1984-cü illərdə Şəkidə Xalça sexində sex ustası, 1984-87-ci illərdə 2 nömrəli toxucu sexində texnoloq, 1987-89-cu illərdə Texnologiya şöbəsində böyük texnoloq, 1989-91-ci illərdə Dəsmal və kəlağayı sexləri üzrə texnoloq, 1991-96-cı illərdə Şəki Tikiş İstehsalat müəssisəsində baş mühəndis və 1996-99-cu illərdə Şəki Tikiş İstehsalat Müəssisəsinin direktoru vəzifələrində çalışmışdır.

T.Şamilov 1999-cu ildən 2004-cü ilədək Şəki Bələdiyyəsinin sədri olmuş və 2004-cü ildən ömrünün sonuna qədər Şəki və Bakı şəhərlərində müxtəlif vəzifələrdə işləmişdir.

Teymurxan Şövkət-Ziya oğlu harada işləməsindən asılı olmayaraq, çalışdığı bütün kollektivlərin dərin hörmətini qazanmış, daim öhdəsinə düşən vəzifəni layiqincə yerinə yetirmişdir.

Teymurxan müəllimin əziz xatirəsi onu tanıyanların, onunla bir yerdə işləyənlərin və eləcə də bütün Şəkililərin yaddaşında yaşayacaqdır.

* * *

**Şəki Bələdiyyəsinin kollektivi, Teymurxan Şamilovun vəfatından kədərləndiyini bildirir və Şəki ictimaiyyəti adından onun ailə üzvlərinə, qohumlarına və yaxınlarına dərin hüznlə baş sağlığı verir.**

**Allah rəhmət eləsin.**

# 50,9 kilometrlik xüsusi əhəmiyyətə malik avtomobil yolu yenidən qurulur

**Şəki rayonunda xüsusi əhəmiyyətə malik, uzunluğu 50,9 kilometr olan Çayqaraqoyunlu-Turan-Cəyirli-Qozlubulaq-Sarıca-Qayabaşı-Bolludərə-Qaratorpaq avtomobil yolunun yenidən qurulması işlərinə başlanılıb.**

Bu barədə AZƏRTAC-a Azərbaycan Avtomobil Yolları Dövlət Agentliyinin mətbuat xidmətindən bildirilib.

Məlumata əsasən, sözügedən yolun 21 kilometri respublika əhəmiyyətli R56 Kərimli avtomobil yoluna düşür. Odur ki, yolun bu hissəsi 2 hərəkət zolaqlı olmaqla 3-cü texniki dərəcəyə uyğun yenidən qurulacaq. Yolun hərəkət hissəsinin eni 7 metr, çiyinlərin eni 2,5 metr olmaqla, ümumi eni 12 metr təşkil edəcək.

Başlanğıcını M5 Yevlax-Zaqatala-Gürcüstan ilə dövlət sərhədi avtomobil yolunun 17-ci kilometrindən götürən Kərimli avtomobil yolu R9 Qaraməryəm-İsmayıllı-Şəki-Oğuz avtomobil yoluna birləşməklə, bölgələri birləşdirmək baxımından xüsusi əhəmiyyətə malikdir.

Qeyd olunub ki, Çayqaraqoyunlu-Turan-Cəyirli-Qozlubulaq-Sarıca-Qayabaşı-Bolludərə-Qaratorpaq avtomobil yolunun qalan 29,9 kilometrlik hissəsi isə 2 hərəkət zolaqlı olmaqla 4-cü texniki dərəcəyə uyğun yenidən qurulur. Burada yolun hərəkət hissəsi 7 metr, çiyinlər 2 metr olmaqla ümumi eni 10 metrdir.

Hazırda layihə çərçivəsində yol boyu yararsız qruntun qazılaraq çıxarılması, yeni yol yatağının inşası işləri aparılır. Daha sonra yol əsasının tikintisi və asfaltlanma işləri görüləcək. Ümumilikdə isə yolun 300 min kvadratmetrdən çox hissəsinə 2 qat olmaqla yeni asfalt-beton örtük döşənəcək.

Bundan başqa, yol boyu mövcud olan suötürücü borular yeniləri ilə əvəzlənəcək, zəruri yerlərdə yeniləri inşa ediləcək. Belə ki, yola müxtəlif diametrli 290 metr uzunluğunda beton, 450 metr uzunluğunda isə dəmir boruların quraşdırılması, mövcud 2 körpünün isə əsaslı şəkildə təmiri planlaşdırılır. Bunun üçün əraziyə lazımi sayda qüvvə cəlb olunub.

Yenidənqurma işləri yol boyu yaşayan vətəndaşların xüsusən payız-qış aylarında gediş-gəlişlə bağlı yaşadıqları çətinlikləri aradan qaldıracaq, yük və sərnişin daşınmasını asanlaşdıracaq. Həmçinin respublikanın iki əsas avtomobil yoluna çıxış əldə olunmaqla rayonlararası məsafə dəfələrlə qısaldılacaq.

**Xatırladaq ki, Şəki rayonunun Çayqaraqoyunlu-Turan-Cəyirli-Qozlubulaq-Sarıca Qayabaşı-Bolludərə-Qaratorpaq avtomobil yolu 11 min əhalinin yaşadığı 8 yaşayış məntəqəsini birləşdirir.**

# Gənclər "Şəki Bələdiyyəsi"ni mükafatlandırdı



**Şəki şəhər Gənclər və İdman İdarəsi ilə YAP Şəki Təşkilatı Gənclər Birliyinin birgə təşkilatçılığı ilə Şəkidə 2 fevral Gənclər Günü münasibətilə tədbir keçirilib.**



**Zərinə Cavadova,**
*Şəhər İcra hakimiyyəti başçısının müavini, ictimai-siyasi və humanitar məsələlər şöbəsinin müdiri*

Tədbirdə gənclərlə yanaşı, şəhər ictimaiyyətinin nümayəndələri, Şəkidə yerləşən hərbi hissələrin əsgər və zabitləri, media nümayəndələri iştirak ediblər. Tədbirdə çıxış edən Şəki şəhər Gənclər və



**Vüqar İsgəndərov və Faiq Məmmədzadə**

İdman idarəsinin rəisi **Vüqar İsgəndərov** gənclərə göstərilən dövlət qayğısından, rayon gənclərinin ictimai-siyasi həyatdakı rolundan, müxtəlif sahələrdə əldə etdikləri uğurlardan danışıb. Tədbirdə çıxış edən Şəki Şəhər İcra hakimiyyəti başçısının müavini - ictimai-siyasi və humanitar məsələlər şöbəsinin müdiri **Zərinə Cavadova** gəncləri 2 fevral Gənclər Günü münasibətilə təbrik edib, xoş və səmimi arzularını çatdırıb. O, Gənclər Gününün təsis olunmasının Ümummilli Lider Heydər Əliyevin adı ilə bağlı olduğunu qeyd edərək Ulu Öndərin ikinci dəfə hakimiyyətə qayıdışından sonra Azərbaycanda dövlət gənclər siyasətinin əsasının qoyulduğunu, gənclər siyasətinin bu gün ölkə Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirildiyini bildirib. Bu gün şəkili gənclərin rayonun ictimai-siyasi, iqtisadi və mədəni həyatında fəal iştirak etdiklərini diqqətə çatdıraraq bu sahədə şəhər gənclər və idman idarəsinin xüsusi rolunun olduğunu vurğulayıb. YAP Şəki Təşkilatı Gənclər Birliyinin sədri, Şəki Şəhər İcra Hakimiyyəti başçısı aparatının şöbə müdiri **Daşqın Mikayılov** gəncləri əlamətdar gün münasibətilə təbrik edib, onlara Azərbaycan dövlətçiliyinin inkişafı və qorunması üçün Vətənə layiqli vətəndaş olmağı arzulayıb.

Sonra müxtəlif nominasiyalar üzrə qaliblər mükafatlandırdı.

"İlin Tələbə Gənclər Təşkilatı" nominasiyası üzrə Şəki Dövlət Regional kollecinə, "İlin gənci" nominasiyası üzrə Təhsil Nazirliyinin "Müəllim sizsiniz" I qrant layihəsinin qalibi **Seymur Kərimova**, "İlin QHT-si" nominasiyası üzrə Şəki Regional Debat Mərkəzi - **Aysel Sadıqlıya** və "Tort" müsabiqəsinin qalibi Şəki Tibb Kollecinə diplomlar və hədiyyələr təqdim edildi. Mükafat alanlar arasında gənclərin dostu kimi Şəki Təhsil Şöbəsinin müdir müavini **Elxan Abdullayev** və gənclərin fəaliyyətini dövri mətbuatda vaxtaşırı işıqlandırdığı üçün "Şəki Bələdiyyəsi" qəzetinin baş redaktoru **Murad Nəbibəyov** da var idi.

Tədbir maraqlı konsert poqramı və gənslərin ifasında kiçikhəcmli səhnəciklərin nümayişi ilə davam etmişdir.



**Aysel Sadıqlı, Vüqar İsgəndərov, Elxan Abdullayev, Murad Nəbibəyov**




**Şəki Tibb Kollecinin mükafata layiq görülən tortu**



# Qədim Şəki qışda da turistləri özünə cəlb edir



**Təranə Abdullayeva,**
*"Yuxarı Baş" Dövlət Tarix-Memarlıq Qoruğunun direktoru*

**Azərbaycanın qədim mədəniyyət mərkəzlərindən olan Şəki bu gün həm də, regionun ən önəmli turizm mərkəzi kimi tanınmaqdadır. Şəki xanlarının sarayı, Kiş kəndindəki qədim alban məbədi, Aşağı və Yuxarı karvansaralar, digər tarixi-memarlıq abidələri yerli və xarici turistlər üçün cəlbedici məkanlar hesab olunur.**

**İlin bütün fəsillərində Şəkiyə gələn turistlərin ən çox üz tutduqları tarixi məkanlardan biri də "Yuxarı Baş" Dövlət Tarix-Memarlıq Qoruğunun ərazisidir.**

Qoruğun direktoru **Təranə Abdullayevanın** məlumatına görə, 2017-ci ildə Şəkiyə gələn 150 minədək turistin təxminən yarısı qoruğun ərazisində olub. Ərazidə yerləşən və Azərbaycan memarlığının nadir incilərindən hesab olunan Şəki xanlarının sarayı, həmçinin V-VI əsrlərə aid Dairəvi Məbəd, xalq tətbiqi sənəti və tarix-diyarşünaslıq muzeyləri, rəsm qalereyası, "Sənətkarlar evi" hər zaman turistlərin diqqətini özünə cəlb edir.

Yeni ilin ilk günlərində Şəkiyə gələn xarici turistlərin içərisində Rusiyadan, həmçinin MDB ölkələrindən gələnlər üstünlük təşkil edib. Rusiyanın Bryansk vilayətindən olan **Sergey Şemelinin** ilk dəfədir Yeni ili dostları və ailələri ilə birlikdə Azərbaycanda qarşılayıb.

**Rusiyalı turist AZƏRTAC-ın bölgə müxbirinə müsahibəsində deyib:** *"Çox gözəl ölkəniz var. Dostlarımızdan birinin valideyni hərbçi olduğu, Bakıda xidmət etdiyi üçün o, bu şəhərdə anadan olub. Məhz dostumuzun təklifi ilə Yeni ili Azərbaycanda qarşılamağı qərara aldıq. Əvvəlcə Bakının görməli yerlərini gəzdik, İçərişəhərdə olduq. Yeni il gecəsi doyunca əyləndik. Paytaxt sakinləri çox mehriban, gülərüz, qonaqpərvərdirlər. Ən əsası, ölkənizdə özümüzü tam təhlükəsiz hiss edirik".*

Regionlarla tanışlığa Şəkidən başladıqlarını diqqətə çatdıran rusiyalı qonaq Xan sarayının onlarda çox böyük təəssürat yaratdığını vurğulayıb. *"Əcdadlarımızın da dediyi kimi, keçmişinə, tarixinə bələd olmayan xalqın gələcəyi yoxdur. Bu abidə xalqınızın çox qədim tarixə, zəngin mədəniyyətə malik olduğunu bir daha sübut edir. Belə sənət əsərlərini qorumaq olduqca vacibdir",-* deyə Qonaq söyləyib.

Rusiyalı turistlər Şəkidən sonra Qəbələyə, "Tufandağ" Qış-Yay Turizm İstirahət Kompleksinə getməyi planlaşdırıblar.



# TƏBRİK EDİRİK!

**Yanvarın 30-da Şəki Bələdiyyəsinin sədri Elşad İbadovun 50 yaşı tamam olmuşdur.**




**Elşad Sirac oğlu İbadov 1968-ci il yanvarın 30-da Şəki şəhərində anadan olub.**

Şəki şəhər 11 saylı orta məktəbi bitirdikdən sonra Azərbaycan Memarlıq və İnşaat Universitetində ali təhsil alıb. 1993-cü ildə Bakı şəhərində "Elevator dəyirmanmaş" zavodunda sex rəisi kimi əmək fəaliyyətinə başlayıb. 1997-2001-ci illərdə Bakı "Kvars" MMC-nin rəisi vəzifəsində işlədikdən sonra doğma Şəkiyə qayıdıb və 2015-ci ilədək Şəki "Diabuz" MMC-də direktor müavini, Şəki 15 saylı Yol İstismar İdarəsində yol ustası, M.F.Axundov adına mədəniyyət və istirahət parkının direktoru vəzifələrində çalışıb.

E.İbadov Azərbaycan Respublikasında 2014-cü il dekabrın 17-də keçirilən bələdiyyə seçkilərində Şəki bələdiyəsinə üzv seçilib və 2015-ci ilin yanvarında bələdiyyə üzvlərinin ümumi yığıncağında Şəki Bələdiyyəsinin sədri vəzifəsinə seçilib.

Yanvarın 30-da Şəki Bələdiyyəsinin kollektivi hörmətli sədrini şirniyyat stolu ilə təbrik etdi.

**Şəki Bələdiyyəsinin kollektivi Elşad müəllimi yarım əsrlik yubileyi münasibəti ilə təbrik edir, ona möhkəm can sağlığı, ailə səadəti və gələcək işlərində daim uğurlar arzulayır.**



# Ötən il Kiş alban məbədinə dünyanın 64 ölkəsindən turist gəlib

**Kiş kəndindəki qədim alban məbədi ilin bütün fəsillərində Şəkiyə gələn yerli və xarici turistlərin, həmçinin qonaqların, beynəlxalq tədbir iştirakçılarının ən çox üz tutduqları, ziyarət etdikləri tarixi məkanlardan biridir. İl ərzində Kiş məbədinə dünyanın 64 ölkəsindən turist gəlib.**

Bu barədə AZƏRTAC-ın bölgə müxbirinə Kiş Tarix-Memarlıq Qoruğunun direktoru **İlhamə Hüseynova** məlumat verib.

Xatırladaq ki, I əsrdə Qafqaz Albaniyasında geniş yayılan Ay məbədinin özülü üzərində qurulan Kiş alban məbədi bütün Qafqazda təqribən iki min il bundan əvvəl xristianlığın yayıldığını rəmzləşdirən məşhur tarixi abidədir. Əhəng daşından tikilən bu abidə erkən orta əsrlərdə yaranan ilkgünbəzli, zal tipli məbəddir. 2001-ci ilin mayında abidədə Azərbaycan-Norveç birgə "Kiş" layihəsi üzrə bərpa işlərinə başlanılıb və 2003-cü ilin sentyabrında məbədin açılışı olub. Layihə məşhur norveçli səyyah, etnoqraf və alim Tur Heyerdalın dəstəyi ilə həyata keçirilib. Alimin xatirəsini əbədiləşdirmək üçün məbədin qarşısında onun büstü də qoyulub.

Kiş məbədi Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2001-ci il 2 avqust tarixli qərarı ilə dünya əhəmiyyətli abidələr siyahısına daxil edilib və tarix-memarlıq abidəsi kimi dövlət tərəfindən qorunur. Məbədin yerləşdiyi ərazidə 2003-cü ildə Kiş Tarixi-Memarlıq Qoruq-Muzeyi yaradılıb. 2009-cu ildə isə muzeyə ayrıca qoruq statusu verilib.



# Dağlar qoynunda keçən

**Yanvarın 23-də Şəki ictimaiyyəti sayılıb-seçilən ziyalılırından birini itirdi... Həmin gün bütün şəkililərin sevimlisi, Azərbaycan poeziyasında özünəməxsus dəst-xətti olan şair-yazıçı, gənc nəslin yetişməsində və püxtələşməsində var qüvvəsi ilə çalışan filoloq-müəllim ŞAHİD MƏMMƏDKƏRİMOV haqq dünyasına qovuşdu.**

**Şahid müəllimin əziz xatirəsini filologiya üzrə fəlsəfə doktoru Kamil Adışirinovun "Şahid Məmmədkərimov yaradıcılığı" yazısını dərc etməklə yad edirik.**

**XX əsr Şəki ədəbi mühitinin layiqli təmsilçilərindən biri Şahid Məmmədkərimov olmuşdur. 1960-cı ildən o, "Şəki fəhləsi" qəzetinin redaksiyasının nəzdində fəaliyyət göstərən "Səbuhi" ədəbi məclisinin sıralarına daxil olmuş, ilk şeirləri həmin illərdən qəzetin səhifələrində dərc olunmuşdur. Əsərlərini *"Məmmədkərimov"* imzası ilə yazmışdır.**

**Şahid Məmmədiyyə oğlu Məmmədkərimov 1939-cu ildə Şəki şəhərində anadan olmuşdur.** Atası Məmmədiyyə Məmmədkərimov 1941-ci ildə Böyük Vətən müharibəsində həlak olmuş, balaca - iki yaşlı Şahid anasının və ana nənəsinin himayəsində böyümüşdür. Yeddinci sinfədək Şəki şəhər 12 saylı orta oğlan məktəbində *(həmin dövrdə oğlan və qız məktəbləri ayrı olmuşdur - K.A)* oxuyan Şahid sonra oğlan və qız məktəbləri birləşdirildiyi üçün təhsilini 11 saylı orta məktəbdə davam etdirmişdir. 1958-ci ildə orta təhsilini başa vuraraq Şəki 6 saylı çörəkxanada əmək fəaliyyətinə başlamışdır. Daim təhsil almaq arzusu ilə yaşayan gənc şair 1964-67-ci illərdə Şəki İpəkçilik Texnikumunun "Parçaların boyanması və pardaxlanması" fakültəsində qiyabi yolla təhsil alaraq "Texnik-texnoloq" ixtisasına yiyələnmişdir.

Sonralar əmək fəaliyyətini Şəki Birləşmiş Hərbi Komissarlığında, "Nuxa fəhləsi" qəzetinin redaksiyasında, Şəki İpək İstehsalı Birliyinin 2 saylı baramaaçan fabrikində davam etdirmişdir. Şair 1973-1980-ci illərdə Azərbaycan Dövlət Universitetinin *(indiki-Bakı Dövlət Universiteti)* filologiya fakültəsində qiyabi yolla ali təhsil almışdır. Universitet mühiti, xüsusilə poeziya dahisi Bəxtiyar Vahabzadədən təhsil almaq şairin ədəbiyyata- poeziyaya vurğunluğunda böyük rol oynamışdır. Ali təhsilini başa vuran gənc müəllim çoxdan arzuladığı müəllimlik fəaliyyətinə 1980-ci ildə Şəki 44 saylı Texniki Peşə Məktəbində başlamış, 1991-ci ildən təqaüdə çıxanadək orta təhsil aldığı Şəki şəhər 11 saylı orta məktəbdə Azərbaycan dili və ədəbiyyat müəllimi işləmişdir. Poeziyaya vurğunluq və şeir korifeylərini sevə-sevə tədris etmək Ş.Məmmədkərimovun bədii istedadını daha da formalaşdırmış, yaradıcılığına yüksək təkan vermişdir. Şairin ilk mətbu şeiri "Araz kənarında" adlanır ki, bu əsər ilk dəfə "Nuxa fəhləsi"qəzetinin 25 aprel 1960-cı il tarixli sayında dərc olunmuşdur. Sonralar Azərbaycan Yazıçılar Birliyinin Şəki filialının üzvü olan şairin əsərləri mərkəzi və yerli mətbuat orqanları olan "Ədəbiyyat", "Zaman", "Elitar-press", "Elmiz-günümüz","Şəki fəhləsi", "Şəki", "Şəki təhsili", "Region-Şəki", "Şəki bələdiyyəsi" kimi dövri nəşrlərdə dərc edilmişdir. Şairin əsərləri həmçinin "Ulduz" və Türkiyədə nəşr olunan "Kumru" jurnallarında, türk şairi Ahmet Kaytançının "Azərbaycanın göz yaşları" kitabında, "Avrasiya şairləri antologiyası"nda, Azərbaycan Yazıçılar Birliyinin Şəki filialının "Söz..., söz..., söz..." və AMEA-nın Folklor İnstitutu tərəfindən hazırlanan "Bənövşə çələngi" almanaxlarında da nəşr edilmişdir. Şahid Məmmədkərimov həmçinin Şəki teatrı ilə də bağlı sənətkar olmuşdur. O, 1960-cı illərdə Şəki Xalq Teatrı truppasının üzvü olmuş, Üzeyir Hacıbəyovun "Arşın mal alan" əsərində Həsənqulu bəy, "Beş manatlıq gəlin" operettasında Nadir, Bəxtiyar Vahabzadənin "Vicdan" pyesində Əlyəsə və s. obrazları səhnədə canlandırmışdır. 2006-cı ildə şairin "Məhəbbətlər arasında", 2013-cü ildə isə "Tanrı pıçıltıları" adlı kitabları nəşr olunaraq oxucuların istifadəsinə verilmişdir.

## Yaradıcılığı:

Ş.Məmmədkərimovun ədəbiyyat yolu saf, təmiz, məntiqli, bədii-fəlsəfi düşüncələr yoludur. Məlumdur ki, bədii üslubda fərdilik şairin kimliyini ortaya qoyan əsas meyardır. Ədəbiyyat bir gülüstanı xatırlatsa da, buradakı hər gülün öz ətri, öz rayihəsi var.

XX əsr Şəki ədəbi mühitinin aparıcı parlaq simalarından olan, istedadlı şair Vaqif Aslan çox doğru olaraq yazır: "Şahid Məmmədkərimovun ən ümdə cəhəti yaradıcılığındakı üslubi özəlliklərdir. Adi danışıq tərzinin şirinliyini poetik şəkildə canlandırmaq, ədəbi dilimizin qanunlarına riayət etmək şərti ilə Şəki şivəsinin dadını-duzunu saxlamaq... Bütün bunlar poetik ovqatı daha da cilalandırır".

Ş.Məmmədkərimovun mövzu qalareyası olduqca zəngindir. Təbiət, məhəbbət, vətənpərvərlik, əxlaqi-didaktik, əməksevərlik və. s. motivlər onun poeziyasının canını təşkil edir. Əməyin şan-şöhrət, xoşbəxtliyin təməli olması hamıya məlumdur. İnsanın tərləməsi adi fizioloji haldır. "Tər", "tərləmək" anlayışları müxtəlif baxımdan mənalandırıla bilər. Ş.Məmmədkərimovun "tər" sözünə münasibəti isə tamamilə poetikdir. Şair "Tər" adlı şeirində müdriklik nümayiş etdirərək "İnsan xöşbəxtliyə yalnız alın təri tökməklə qovuşa bilər" qənaətini təsdiqləmişdir:

*Bağban ağac əkdi*
*gözləri güldü,*
*Neçə calaq vurdu*
*tumurcuqlardan.*
*Suyun əvəzinə*
*tər tökülürdü,*
*Torpağı çevirib*
*əkdiyi zaman.*

*Aylar ötüb keçdi*
*min bar yetirdi,*
*Həm alma, həm üzüm,*
*həm nar oldu tər.*
*Loğmantək sağaltdı*
*çarəsiz dərdi,*
*Qəlbləri oxşayan*
*bahar oldu tər .*

Ş.Məmmədkərimov şeirin son bəndində bədii manevr edərək "tər"sözünə didaktik məna verir. İnsanı, xüsusilə, gənc nəsli əməksevər görmək istəyən şair onların alnında pis əməllərin nəticəsi kimi xəcalət tərini görmək istəmir:


ŞAHİD MƏMMƏDKƏRİMOV

*Hər an muncuq-muncuq*
*axıb gələydi,*
*Əməyin qədrini*
*biləndən bəri.*
*Deyirəm heç zaman*
*görünməyəydi,*
*Təki alnımızda*
*xəcalət təri.*

"Düşünürəm" adlı şeirində şair təbiət detalı olan "bulud" anlayışına fəlsəfi aspektdən yanaşaraq xeyirlə-şər kontekstində qüvvətli təzad yaradır. Buludun yağışa çevrilərək susuzluğa çarə olması şairi sevindirirsə, onun ildırım olub çaxaraq haralarısa yandırması qəm-qüssə, kədər yaradır. Şair yazır:

*Göy üzündə görünəndə,*
*Bircə topa qara bulud,*
*Düşünürəm hardan gəlir?*
*İndi gedir hara bulud?*
*Bəlkə, susuz bir səhraya*
*üz çevirib,*
*Olacaqdır çara bulud.*
*Bəlkə... bəlkə gurlayacaq*
*bir dərədə,*
*İldırımlar çaxacaqdır.*
*Simşək olub bu dərəyə,*
*O dərəyə axacaqdır.*
*Nə biləsən haraları*
*yandıracaq,*
*Haraları yaxacaqdır?..*

Yoxsul, acınacaqlı həyata şair baxışı və bu baxışdakı fəlsəfi ovqat Ş.Məmmədkərimovun "Yamaq" adlı şeirində də diqqətçəkicidir. Şeir bir növ avtobioqrafik səciyyə daşısa da, bədii qayə baxımından zamanın acınacaqları ilə oxucunu tanış etmək məqsədi daşıyır. Şeirin ikinci bəndinin sonuncu iki misrasında da kədərlə sevinc üz-üzə dayanıb:

*Yamaq böyüklərə kəskin*
*kədər, qəm,*
*Uşaq dünyasının*
*sevinci idi.*

Misraların məna yükü o qədər anlaşıqlıdır ki, oxucu dərin düşüncəyə dalmadan şairin nə demək istədiyini anlayır. Bu bədii nümunədə həmçinin şairin vətənsevərlik duyğuları da diqqətçəkicidir. Əsərin sonuncu iki bəndində Ş.Məmmədkərimovun ən müqəddəs arzusu vətənini yamaqlı görməməkdir:

*Hər an düşünürəm,*
*deyirəm ki, kaş,*
*Nənəmin vurduğu*
*yamaq duraydı.*
*Ondan bətərinə dözərdim,*
*qardaş,*
*Vətənimə yamaq*
*vurulmayaydı .*

Ş.Məmmədkərimovun vətənpərvər poeziyasında dil məsələləri, ona sevgi və bağlılıq, zaman və insan, vətəndaş adlanan şəxslərin vətənə münasibəti, xüsusilə XX əsrin 90-cı illərinin əvvəllərində ölkədə baş alıb gedən xaos şairin müşahidələrindən kənarda qalmamış müxtəlif məzmunlu bədii nümunəyə şevrilərək yaradıcılıq fondunu bəzəmişdir. Dilim mənim" şeirində şair doğma ana dilini qılıncdan kəsərli sözü, tarixlərdə izi, el içində müdrikliyi, özü sanaraq fəxrlə yazır:

*Dilim mənim -*
*Tarixlərdə izim mənim.*
*Laylalarda şəkər-şirin,*
*El içində müdrikliyim.*
*Düşmənlərin qarşısında,*
*Kəsən qılınc*
*sözüm mənim.*
*Dilim mənim -*
*Həm keçmişim,*
*həm sabahım,*
*həm bu günüm.*
*Qısa desək, özüm mənim .*

"Hara aparır zaman" şeiri şair qəlbinin kədərini ölçən bir tərəzi kimi oxucunun diqqətini cəlb edir:

*Bir günün içində,*
*Dura bilmirəm bir ölçüdə,*
*bir biçimdə.*
*Həyat çalxalanır içimdə.*
*Gah təndir kimi*
*Yandırıb yaxır məni,*
*Gah da titrəyirəm*
*soyuqdan...*
*Vətən satan, kəfən satan,*
*Halalı harama qatan...*
*Əyrisini, düzünü satan,*
*Doğru, yalan sözünü satan*
*Heç nəyi olmayanda*
*İstəsən özünü satan,*
*Beləcə çirkaba batan,*
*Bədbəxt insan.*
*Yapış pulun yaxasından,*
*Səni hara aparır zaman?!.*

Ş.Məmmədkərimov milli kökə bağlı, folklor və etnoqrafik mədəniyyətimizi gözəl bilən bir şairdir. O, uzun illər gəncliyi tərbiyə edən bir müəllim olaraq millətin gələcək təmsilçilərini ağıllı, milli adət-ənənələri gözəl bilən bir qüvvə kimi görmək istəmiş, ustad bir müəllim kimi dərslərini həmişə bu xüsusiyyətlər üzərində qurmuşdur. Bildiyimiz kimi, hörüklər milli qızlarımıza malik əsas xüsusiyyətlərdəndir. Əbəs deyildir ki, möhtəşəm sənət abidəmiz olan "Kitabi- Dədə Qorqud" dastanlarında qadınlarımız öyülərkən "Yeriyəndə ayağına dolaşan qara saçlım" müraciətləri işlədilmişdir. Lakin imperiya əsarətində yaşadığımız illərdə müasirlik əlaməti kimi qadınlarımızın saçlarının kəsilməsinə start verilmiş, bu mənfi təzahürə qarşı münasibət bir sıra milli düşüncəli şairlərimizin yaradıcılığında bildirilmişdir.

XX əsr Şəki ədəbi mühitində hörüklər mövzusunda şeirlər Yusif Şükürlünün və Muxtar Qiyasinin yaradıcılığında da vardır. Lakin mövzu eyni olsa da, hər bir şairin obyektə yanaşma tərzi başqadır. Ş.Məmməkərimovun "Hörüklər" şeiri 1961-ci ildə yazılmışdır. Şeir o dövrdə "Səbuhi" ədəbi məclisində oxunmuş, lakin nədənsə, şairin milli mövqeyi məclis üzvləri tərəfindən dəstəklənmədiyi üçün çap edilməmişdir. Bakıda yaşamasına baxmayaraq Şəki ədəbi mühitini daim izləyən dahi şair Bəxtiyar Vahabzadə məclis üzvləri ilə Şəkidə görüşərkən "Hörüklər" şeirini dinlədikdən sonra şeirin dərcini tövsiyə etmiş, şeir "Nuxa fəhləsi" qəzetinin səhifələrində dərc edilmişdir. Şeirin məzmun və forma gözəlliyini əsas tutaraq büsbütün oxucuların diqqətinə çatdırırıq:

*(Ardı 11-ci səhifədə)*

# müəllim, şair ömrü




(Əvvəli 10-cu səhifədə)

*Görünmür qızların*
*gərdənlərində,*
*Görən necə olub qara*
*hörüklər?*
*Razıyam topuğa çatıb*
*hər səhər,*
*Məni oddan-oda sala*
*hörüklər.*

*Qızlar səhər xırda*
*hördüyü anda,*
*Gəlində baş-başa*
*qoşa duranda,*
*Meh əsib sinəmə*
*hərdən vuranda,*
*Məni ilan kimi çala*
*hörüklər.*

*Anamın, nənəmin bağı,*
*baharı,*
*Bizə bəxş etdiyi*
*bir yadigarı,*
*Qızlar tərk eylədi,*
*yoxsa qızları,*
*Tərk edib qaçırdı*
*hara hörüklər?*

*Sözümü almışam*
*min bir könüldən,*
*Qızlar incisə də*
*deyəcəyəm mən,*
*Ayrı dolanmayıb*
*obadan,eldən,*
*Hələ milyon illər qala*
*hörüklər*

*Şahidəm, hər arzum*
*açsın gül-çiçək,*
*Bilirəm qış gedib*
*bahar gələcək,*
*Nigarın, Həcərin*
*hörükləritək,*
*Əsri kəməndinə sala*
*hörüklər .*

Şər insana məxsus eybəcər mənəvi-əxlaqi keyfiyyətdir. Ş.Məmmədkərimov gəncliyi hər zaman bu xüsusiyyətdən kənar olmağa çağıraraq, "Şər" adlı şeirində özünün folklor görüşlərini də oxucusu ilə bölüşür. El sözü olan *"İki adamın arasından keçən şərə düşər"* deyiminin poetik ilməsini aşağıdakı kimi vurur:

*Adlarını bilmədiyi*
*İki adam arasından*
*Heç bir zaman*
*Keçməz idi nənəm mənim*
*Şərə düşər.*
*Hər addımda onun ilə*
*şər görüşər.*
*Ox ay nənə*
*Qurban olum adətinə.*

Şahid Məmmədkərimovun məhəbbət dünyası da sirli-soraqlıdır. Şairin bu mövzuda çoxlu şeirləri vardır. Hansı janrda yazılmasına baxmayaraq bu əsərlərin hər birində məzmun rəngarəngliyi və forma gözəlliyi var. Şairin təbiətə və insana sevgisi tükənməz olduğundan bu ünvanlı şeirlər onun bədii fondunda çoxluq təşkil edir. Bu silsiləyə "Ayrılmayaq", "Mənim sevincim", "Ürəyimcəsən", "Qara rəng", "Siləndə sən", "Olum", "O sənsən, sən özünsən", "Neyləyim", "Sevməyə nə var ki", "Dəmli, qəmli, nəmli göz", "Səpələnibdir", "Yar", "Tələs, tələs", "Qalıb", "İstəyir", "Edəcəksən", "Səni gözləyirəm mən", "Məni dəli etmisən", "Mənim məhəbbətim, ilk məhəbbətim", "Toxunma qəlbimə", "Qəlbimdə gizlənmisən" və s. şeirləri daxildir.

Ş.Məmmədkərimovun poeziyasında poema janrına da müraciət edilmiş, şairin istedadlı qələmindən "Ərizənin cavabı" və "Axşam düşüncələri" adlı poemalar da çıxmışdır. Birinci poema dahi dramaturq M.F. Axzundzadənin həyatına, ikinci əsər isə Böyük Vətən müharibəsi illərində arxa cəbhədə yaşayan insanların güzəranına həsr olunmuşdur. Hər iki əsər lirik-epik səciyyə daşıyır.

Ş.Məmmədkərimovun bədii fondunda balaca uşaqların da öz payı vardır. Uzun illər uşaqlarla işləyən şair gənc nəslin təlim-tərbiyəsinə dair də bir sıra uşaq əsərləri yazmışdır. Onun "Ayselin söhbəti", "Lalənin cavabı", "Beşikdəki körpələr", "Qabların şikayəti", "Tərif deyənimiz var" və s. şeirlərində uşaq dünyasının sirli-soraqlı tərəfləri verilmişdir.

Ş.Məmmədkərimovun yaradıcılıq laboratoriyası təkcə lirik və lirik-epik səpgili əsərlərlə məhdudlaşmamış o, bir ədəbiyyat mütəxəssisi kimi həyatı müşahidələrini epik və dramatik növün müvafiq janrlarında da aparmışdır.

Yazıçı hələ 60-cı illərdə "Səbuhi" ədəbi məclisinin sıralarında böyük sənət yolu keçərkən çağdaşları kimi qələmini kiçik həcmli hekayələr və dram janrı sahəsində də sınamışdır. Açığını desək, onun süjeti yığcam, dili şirin, zəngin və sadə, mövzuca müasir olan hekayələrinə nisbətən dram nümunələri zəif təsir bağışlayır. Bu yazıçının qələminin heç də kəsərinin aşağı olması ilə ölçülməyib, dövrün tələblərindən irəli gələn bir məsələdir. Belə ki, yazıçı bir müəllim kimi əsas məqsədlərini gənc nəslin tərbiyəsi üzərində ümumiləşdirdiyindən çap imkanlarını nəzərə alaraq müasirləri kimi yaradıcılığında həmişə kiçik həcmli, dolğun ideyalı əsərlərə üstünlük vermişdir. Ş.Məmmədkərimovun epik fondunda mühafizə olunan "Arxadan gələn səs", "Eynək əhvalatı", "Təsadüfi ortaq", "Burda insan yaşayır" və.s kimi hekayələrində janrın tələbləri qorunmaqla həyata olan obyektiv baxış, realist əksetdirmə diqqətçəkicidir.

Yazıçının "Arxadan gələn səs" adlı hekayəsində ideya daha qüvvətlidir. Müəllif Gülgəz adlı bir qızın ağır zəhmətdən-tütün sahəsindən evə qayıtması fonunda cəmiyyətin müxtəlif tərəflərinə səyahət etmişdir. O, qəhrəmanının yol əhvalatını onun düşüncələr boxçasından açıb ortaya qoyaraq sovet cəmiyyətində olan çatışmazlıqları açıb göstərmək istəmişdi. Gülgəzin düşüncələri arxadan gələn, ancaq görünməz olan səs sahibi ilə bağlıdır. Yazıçı sahibsiz səs fonunda oxucuya həzin məhəbbət notları da çalır. Qəhrəmanının keçmişi, sevgilisi Murad, onun işsizlik ucbatından kəndin digər cavanları kimi yad ölkəyə - Rusiyaya getməsi, bəlkə yad təsirlər altında vətənə qayıtmaq istəməməsi də Gülgəzin xəyalları vasitəsilə oxucuya çatdırılır. Əslində bu mənzərə Şahid Məmmədkərimovun XX əsrin 90-cı illərinin əvvəllərində üzləşdiyimiz ağır iqtisadi güzəranın bədii təsviri idi. Yazıçının təsvirləri ürək ağrıdıcıdır: *"...Murad hərbi xidmətdən qayıtdı. Ancaq necə deyərlər, Murad pul tapmırdı ki, el adətincə toy eləsin. Yaxınları da kömək edə bilmirdilər. Zaman elə gətirmişdi ki, bir loxma yavan çörək birtəhər əldə edilirdi. Odur ki, Murad qoşuldu kənd cavanlarına, yollandı Rusiyaya ki, toy pulu əldə etsin..".*

Hekayədə yazıçı digər ictimai kəm-kəsirləri də hekayənin süjetində əritməyi bacarmışdır. Yuxarıda sözügedən illərdə tez-tez təsadüf edilən enerji qıtlığı da oxucunun diqqətindən yayınmır: *"...Kəndin işıqları yanmırdı. Amma pəncərələrdən lampa və şam işıqlarının solğun parıltısı görünürdü..".* Gülgəzi yolboyu müşayiət edib gözə görünməyən, onu qorxu içərisində saxlayan "arxadan gələn səs"in açılması oxucuda müəllif qayəsinə böyük məhəbbət oyadır. Hekayədən oxuyuruq: *"...Addım səsləri yenə eşidildi və qapının ağzında kəsildi. Gülgəz həyəcanla qapıya tərəf çevrildi. Kimsə qapını toxaladı... O, bütün qüvvəsini toplayıb qapının arasından diqqətlə çölə baxdı: - Aman, Allah!-deyib qapının kilidini açdı. Ayaqları sözünə baxmadı, büküldü. Özünü birtəhər küncdəki daşın üstünə çatdırdı, dizlərini qucaqlayıb hönkürtü ilə ağladı. Qapı açıldı. Atasının ölümündən sonra başlı-başına buraxılmış yabı tövləyə keçib yerini rahatladı və kişnədi".*


Şahid müəllim nəvələri ilə

Müəllifin oxucuya təlqin etdiyi məqsəd çöldə uzun müddət sahibsiz dolaşan bir heyvanın - atın yurda bağlılığı ilə öz doğma yerinə qayıtması epizodu ilə açılır. Müəllif oxucularını yurdsevər, vətənpərvər olmağa çağırır.

Ş.Məmmədkərimovun "Eynək əhvalatı" və "Təsadüfi ortaq" hekayələri satirik səpgidə yazılmışdır. XX əsrin 60-cı illərində "Səbuhi" ədəbi məclisinin üzvlərinin yaradıcılığında özünü göstərən realist satirik nəsrə meyl, gənc yazıçı Ş.Məmmədkərimovun yaradıcılığında da özünü biruzə vermişdi.

"Eynək əhvalatı" hekayəsində yazıçı adını gizlətdiyi müdir surəti ilə zəmanəsinin rüşvətxor idarə rəhbərlərinin, təlxək Nadir surəti ilə isə yaltaq insanların obrazını yaratmışdır. Ş.Məmmədkərimov eynək əhvalatı ilə məqsədini açıqlayaraq bədii düyümünü Nadirin müdirə dediyi: *"- Nə danışırsan, ay müdir, düz otuz ildir burada işləyirəm. Neçə-neçə müdir üzü görmüşəm. Bəyəm indiyə kimi öyrənməmişəm ki, müdirə verilən eynək geri alınmaz?!. Eynək sizindir!"* - sözləri ilə vurmuşdur.

"Təsadüfi ortaq" satirik hekayəsində irəli sürülən ideya daha dərindir. Müəllif nəzarətsizlik ucbatından, yaxud idarə rəhbərlərinin himayədarlığı ilə dövlət əmlakını dağıdan ünsürlərə özünün satirik münasibətini bildirmişdir. Hekayədə hadisələr Şəkinin Qışlaq ərazisində Usta Fərruxun evində baş verir. Bədii uslubun obraz dilini və hadisələrin cərəyan etdiyi məkan xüsusiyyətlərini gözəl bilən müəllif obrazların dilində nəinki Şəki dialektini, hətta dialektin şivə xüsusiyyətlərini də incəliklə oxucusuna diktə edir: *"Əə, Fərrux, sən öl, belə getsə sən dəli olacaxsan. Əə, mən səni də yaxşı tanıyıram, oğlun Fuadı da. Bu gün sabah oğlunu aparacaxlar əsgərə. Nə bilim ursiyətin harasına düşücax, onda nağarıcaxsan?"*

Əsərin mənfi qəhrəmanlar qütbünü oğrular qrupunun təmsilçiləri olan Xəsis Rəsul və Kərpickəsən Nurəli təmsil edirlər. Onlar adəti üzrə idarənin anbarından oğurladıqları taxta ilə yüklənmiş maşını sorğusuz-filansız iş yoldaşları Usta Fərruxun qapısına sürmüşlər. Oğruları həyəcanlandıran onları milis əməkdaşlarının təqib edib etməməsidir. Bu gözlənilməz hadisədən baş açmayan Fərrux nə edəcəyini bilmir və oğruların təhriki ilə "yoxlama əməliyyatı"na göndərilir.

Müəllif hekayənin süjetini daha maraqlı etmək və oğruların iştahını boğazlarında qoymaq üçün Fərruxun oğlu Dülgər Fuad surətini də meydana gətirir. Usta Fərrux küçədə milis izi axtararkən milislərdən daha təhlükəli hesab edilən "Agent" ləqəbi ilə tanınan Mustafa ilə rastlaşır. Hadisələr hələlik oğruların xeyrinə cərəyan edir. Oğrular bir maşın taxtanı Usta Fərruxun evinə boşaldıb məmnun halda oranı tərk edirlər. Bu əhvalatın üzərindən bir neçə ay keçir. "Köməkliyinə" görə Usta Fərruxun maaşı birdən-birə artaraq 400-450 manat olur. Günlərin bir günü Fərruğun qapısı döyülür. Gələn oğurluq malın keçmiş sahibləri olan Xəsis Rəsul və Kərpickəsən Nurəlidir. Müəllifin ifşa oxu artıq hədəfə tuşlanıb. Əvvəl ayaq açdıqları evin çürük taxtalarının parıltılı təzə taxtalarla əvəz edilməsini gördükdə oğruları dəhşət bürüyür. Necə deyərlər: "Oğrudan-oğruya halaldır" - deyib atalar. Məlum olur ki, Usta Rəsulun oğlu Dülgər Fuad yaranmış vəziyyətdən ustalıqla istifadə etmiş, oğruların malına ortaq olaraq taxtaları evlərinin abadlaşdırılması üçün istifadə etmişdir. Fuad tərəfindən milisə təqdim ediləcək şəkilləri gördükdə oğrular dəli olmaq dərəcəsinə çatırlar.

Ş.Məmmədkərimovun istedadlı yazıçı qələmindən çıxan bu maraqlı bədii nümunə mövzuca XX əsr Şəki ədəbi mühitinin qüdrətli nümayəndələrindən olmuş Məmmədiyyə Süleymanlının "Yarımçıq Həmid" felyetonunu xatırladır. Sözügedən felyetonda da taxta məsələsi əsas təsvir obyektidir. Fərq bundadır ki, Ş.Məmmədkərimovun əsərində taxta oğruları oğurluq hadisəsini gizli şəkildə həyata keçirirlərsə, "Yarımçıq Həmid"də oğurluq hadisəsi "qanun çərçivəsində" yüksək vəzifəli məmurlar tərəfindən açıq-mədəni şəkildə həyata keçirilir.

Ş.Məmmədkərimovun "Gözübağlılar", "Səməni, ay səməni" və "Qonaq" əsərləri dramatik səpgidə qələmə alınmış, birinci əsərdə müəllif görkəmli komediyanəvis Sabit Rəhmanın sənətinə məhəbbətini bildirmiş, gənc nəsli mütaliəyə həvəsləndirmək məqsədini güdmüşdür. İkinci əsərdə Novruz bayramı qədim tarixi köklərə malik olan bir bayram kimi səciyyələndirilmişdir. "Qonaq" əsərində müəllif doğma yurdunun tarixini və təbii gözəlliklərini qələmə almışdır.

Ş.Məmmədkərimov həmçinin kəsərli qələmə məxsus bir publisist kimi də ədəbi mühitdə tanınır. Onun XX əsrin görkəmli alim-yazıçısı **Arif Abdullazadənin, şair Vaqif Aslanın, Aşıq Sakitin, Mayis Səlimin, Abbas Əmbalanın, şairə Ruhangiz Rəhimlinin** yaradıcılığı ilə bağlı yazmış olduğu elmi məzmunlu məqalələr onu mükəmməl ədəbiyyat bilicisi kimi təqdim edir. Şair-müəllim həmçinin çağdaşları olan görkəmli ictimai-siyasi şəxsiyyətlər olan **Şahid Abdulkərimov, Mustafa Əhmədov, Əhmədiyyə Cəbrayılov** haqqında yazmış olduğu oçerklərlə bədii publisistikanın mükəmməl nümunələrini ya-ratmışdır.

GÖRKƏMLİ ADAMLARIN HƏYATI

# "Yaddaşda və idrakda qərarlaşan milli sərvət"

# Yaşar Qarayevin stolundakı yazı

***"Əgər Zaman - tarixi və estetik özünüdərkin faktına və hadisəsinə çevrilmirsə, demək, idrakla və yaddaşla Zaman arasında təmas baş vermir... Əgər tarixin dərslərindən şüur ibrət götürmürsə, günahkar Zaman yox, şüurdur. Əgər tarixin əməyi Sizif təsəvvürü və obrazı yaradırsa, bu da yenə Zamanın yox, şüurun xidmətidir!"***

**Yaşar Qarayev**

**Aynur XƏLİLOVA,**
*filologiya üzrə fəlsəfə doktoru, dosent*

**Zaman formal olaraq (!) müəyyən edilmiş rəqəmlərlə vaxtı bəlləndirmək üçün icad olunmuş cihaz deyil ki, istədiyimiz vaxt əqrəblərini kiçik bir toxunuşla anındaca geri çəkə bilək. Belə olsaydı, dünya və ümumilikdə kainat, bəlkə də, yarana biləcək ən böyük xaosla üz-üzə qalardı.** Zaman intəhasız kainatda, məlum və naməlum sivilizasiyalarda Yaradanın lazım bildiyi ahəng və tezlikdə tarazlanmış şəkildə mövcud olan idrakdan kənar bir mücərrədlikdir. Onu nə dayandırmaq, nə də öz xeyrinə dəyişdirmək mümkün deyil. İnsana ayrılmış ömür adlı kiçik zaman kəsimi bu böyük Zamanla nisbətdə dəryada bir damla qədərdir. İnsan ömrü bu böyük Zamana tabedir, onun içərisində əriyir, nəzərdə tutulmuş müddət bitdikdə isə öz fərdi qiymətini yaşayaraq fiziki-cismani mövcudluğunu başa vurub ruhi mövcudluğa keçid alır. Təkcə İlahi aləmdə deyil, maddi həyatda da ruhi-mənəvi mövcud olmanı təmin etmək üçün İnsan onun üçün ayrılan ömür payının ən böyük sərvət olduğunu və bu sərvətdən necə istifadə etməyi dərk edir. **Məhz bu həqiqəti dərk edənlərdən olduğu üçün *"Vaxt sərvətdir"* kəlamını yazdırıb iş otağında stolunun üzərinə qoymuşdu Yaşar Qarayev.** Özünə və başqalarına təlqin etmək, xatırlatmaq üçün. Və bu həqiqətin dərkinin nəticəsi idi ki, fiziki mövcudluğun qarantı olan ömür payını boşuna xərcləmədi bu böyük alim. Fərqli elmi-bədii təfəkkürünün təzahürü kimi ortaya çıxan və gərəkli istinad mənbəyi olan dəyərli əsərlər yazıb yaratdı.

Yaşar Qarayevin əsərləri ədəbiyyatın ən müxtəlif dövrlərini və ayrı-ayrı problemləri əhatə edir. *"Onun əsərlərini tam halda "Azərbaycan ədəbiyyatının problemləri" də adlandırmaq olar"* **(İsa Həbibbəyli).**

Yaşar Qarayevin problemə yanaşma tərzi dar çərçivə ilə məhdudlaşmır. O, araşdırmanı mövzuya daha geniş rakurslardan yanaşaraq gerçəkləşdirir ki, bu da onun tədqiqatlarının ideya-mövzu dərinliyini təmin etmiş olur. Analitik təfəkkür, yüksək erudisiya, müxtəlif maraqlı və yalnız ona məxsus (!) maneralar etmək istedadı, ümumiləşdirmə bacarığı, güclü məntiq və fəlsəfi idrak, obrazlı-poetik düşüncə və ifadə tərzi, emosional ovqat və s. Yaşar Qarayevi bir alim kimi səciyyələndirən keyfiyyətlərdir. O, bir sıra əsərlərində problemi təkcə ədəbi-nəzəri-tənqidi istiqamətdə araşdırmaqla kifayətlənməyib mövzunun fəlsəfi müstəvidə də mahiyyətinə varmışdır. **Və bu spesifik cəhət onu *"Ədəbiyyatşünaslığın filosofu", "Ədə-biyyat filosofu", "Tənqidçi-fi-losof"* səviyyəsinə yüksəltmişdir.** *"Yaşar Qarayev ədə-biyyatşünaslığı ədəbiyyatın ət-rafında dolanan passiv təsvir-dən... onu bədii ədəbiyyat haq-qında təfəkkürün mükəmməl formalarından biri olan düşü-nən elmə çevirmək sahəsində, demək olar ki, ən böyük iş-lərdən birini (bəlkə də, birincisini) gördü... Onun ədəbiyyat filosofu kimi düşüncəsinin bü-tün inqilabi miqyası, orijinallıq keyfiyyəti... səksəninci illərin ortalarından təzahür edir. Ya-şar Qarayevin fəlsəfəsi ədə-biyyat barəsində ardıcıl, sistemli düşüncədən yaranır: hə-min fəlsəfənin bütün qneseoloji potensialı ədəbiyyatı ən müxtəlif təzahür formalarında dərk etməyin nəticəsidir"* **(Nizami Cəfərov).**

**Yaşar Qarayevin bir sıra tədqiqatlarında mövzuya yanaşma müvafiq olaraq Şərq dəyərləri, ortaq Türk və İslam kontekstində gerçəkləşdirilmişdir.** O, bəzilərindən fərqli olaraq, millət, tarix, vətən, milli şüur, azərbaycançılıq, mənəvi dəyərlər və bu qəbildən olan anlayışların ifadə etdiyi semantik tutumun mahiyyətinə vararaq tədqiqatın obyekti və predmetini məqsədəuyğun şəkildə bu müstəviyə yönəltmiş və araşdırmanı da əlaqəli şəkildə həyata keçirmişdir.

Yaşar Qarayevin əsərlərini bir dəfə oxuyub yararlanmaq kifayət etmir. Bu əsərlər sözügedən sahə ilə bağlı olan insanların, ədəbiyyat adamlarının vaxtaşırı müraciət etməyə ehtiyac duyduqları sanballı ədəbi-elmi tutuma və dərin məzmun-mündəricəyə malik, ağır siqlətli, aktual mövzulara həsr olunmuş gərəkli mənbə, fikir-ideya qaynaqlarıdır. Bu baxımdan sözügedən əsərlərin AMEA Nizami adına Ədəbiyyat İnstitutunun yenidən nəşr etməsi həm Yaşar Qarayevin ruhuna və irsinə hörmət, həm də ədəbiyyatşünaslığımıza bir töhfədir. Professor **Şirindil Alışanlı** və dosent **Aygün Ba-ğırlının** birgə tərtibatı ilə yeni çapdan çıxmış ***"Seçilmiş əsərləri"***nin beş cildliyinə ali-min *"Azərbaycan ədəbiyyatında faciə janrı", "Səhnəmiz və müasirlərimiz", "Tənqid: problemlər, portretlər", "Poeziya və nəsr", "Xarıbülbülün nağılı", "Ədəbi üfüqlər", "Realizm: sənət və həqiqət", "Meyar - şəxsiyyətdir", "Tarix: yaxından və uzaqdan", "Min ilin sonu"* kitabları, müxtəlif illərdə çeşidli mövzularda yazıb nəşr etdirdiyi məqalələri, eləcə də, məruzə, müsahibə və çıxışları toplanmışdır. Beş cildliyə Şirindil Alışanlının yazdığı ön sözdə Yaşar Qarayevin yaradıcılığı geniş şəkildə təhlil olunmuş, ədəbiyyatşünaslıq, ədəbiyyat tarixçiliyi, teatrşünaslıq, estetika və humanitar elmlərin nəzəri-metodoloji problemlərinə həsr edilmiş ayrı-ayrı əsərlərinə, "elmi-nəzəri fikrin yaxın müddətdəki başlıca tədqiqat istiqaməti və onun milli məzmununu əks etdirən konsepsiya"sına diqqət çəkilmiş, nəzəri irsi ümumilikdə və müasir ədəbiyyatşünaslığın metodoloji axtarışları kontekstində təhlil-tədqiq edilmiş, həmçinin xatirəyə çevrilmiş bir sıra yaddaqalan məqamlar əks olunmuşdur.




Beş cildliklə eyni vaxtda çap olunmuş *"Yaşar Qarayev: yaxından və uzaqdan"* adlı məqalələr və xatirələr toplusuna isə ədəbi-elmi ictimaiyyətin nümayəndələrinin, müəllimlərinin, dostları və yaxınlarının, institutun əməkdaşlarının (**Məmməd Arif**, **Məmməd Cəfər**, **Kamal Talıbzadə**, **Bəxtiyar Vahabzadə**, **Tofiq Hacıyev**, **İsa Həbibbəyli**, **Həsən Həsənov**, **Şirindil Alışanlı**, **Nizami Cəfərov**, **Anar**, **Elçin**, **Qəzənfər Paşayev**, **Teymur Kərimli**, **Vaqif Yusifli**, **Aygün Bağırlı**, **Elnarə Akimova**, **Rüstəm Kamal**, **Tehran Əlişanoğlu**, **Əlizadə Əsgərli**, **Rahid Ulusel** və b.) alim haqqında müxtəlif illərdə yazdıqları məqalə və xatirələri, tələbəlik illərindən ömrünün sonuna qədər yaxın dostu olmuş **Hüseyn Kürdoğlunun** ona həsr etdiyi şeirləri daxil edilmişdir. Üç bölümdə (***1. Yaşar Qarayev irsi: ədəbiyyatın tarixi və müasir problemləri; 2. Yaşar Qarayev ədəbi-nəzəri fikrin yaddaşında; 3. Xatirələr.***) tərtib olunmuş bu kitaba akademik **İsa Həbibbəylinin** yazdığı ön sözdə, başlıca olaraq, Yaşar Qarayevin Azərbaycan ədəbiyyatşünaslığındakı mövqeyi, xidmətləri, yaradıcılığının əhəmiyyəti və spesifik xüsusiyyətləri, onu tənqidçi-ədəbiyyatşünas kimi xarakterizə edən əsas cəhətlər diqqət mərkəzinə çəkilmişdir. Yaşar Qarayevin elmi fəaliyyətini ədəbiyyatşünaslıq tariximizdə xüsusi mərhələ kimi vurğulayan İsa Həbibbəyli onu klassik ədəbiyyatşünaslıq yanaşmaları ilə yeni elmi-ədəbi təfəkkür arasında möhkəm əlaqələndiricilik və ötürücülük missiyasını həyata keçirən, eyni zamanda, böyük başlanğıcların da əsasını yaradanlardan biri kimi xarakterizə etmişdir. Həmçinin mütəfəkkir ədəbiyyatşünasın elmi irsi və ideyalarını XXI əsrin milli ədəbiyyatşünaslıq elminin strategiyasını müəyyən edən mənbə kimi dəyərləndirmişdir.

Məqalələr və xatirələr toplusu **Aygün Bağırlının** Yaşar Qarayevin işıqlı portreti fonunda qələmə aldığı maraqlı yazısı ilə yekunlaşır. Burada Yaşar Qarayevin tədqiqatlarındakı bir sıra məqamlara, fərqli ifadə tərzinə, əxlaq və halallıq haqqındakı fikirlərinə, həmçinin, insan kimi şəxsi keyfiyyət göstəricilərinə diqqət çəkilmişdir. **Ədəbiyyatşünaslıq tariximizdə özünəməxsus mövqe qazanmış Yaşar Qarayevin bu günkü və gələcək nəsillər üçün bir məktəb olduğu vurğulanmışdır.**

Yaşar Qarayevin ədəbi tənqidin ədəbi proseslə bağlı sistemli fəaliyyətinin həyata keçirilməsində xüsusi xidmətləri olmuşdur. Onun təşəbbüsü və iştirakı ilə 1976-cı ildə əsası qoyulan bu ənənə bu gün Ədəbiyyat İnstitutunda daha geniş şəkildə davam etdirilir.

**Yaşar Qarayevin uzun illər əməkdaşı və direktoru olduğu Nizami adına Ədəbiyyat İnstitutu bu bənzərsiz alimin xatirəsini hər zaman əziz tutmuşdur.** Oktyabrın 26-da institutda alimin 80 illik yubileyi ilə əlaqədar *"Yaşar Qarayevin irsi: ədəbiyyatın tarixi və müasir problemləri"* mövzusunda keçirilən elmi sessiyada bir sıra maraqlı məruzə və çıxışlar dinlənildi. Tənqidçi-ədəbiyyatşünas **Rüstəm Kamal** çıxışında Yaşar müəllimin ən çox işlətdiyi sözlərdən birinə - **sərvət** sözünə, *"Vaxt sərvətdir", "Cəsarət sərvətdir", "Şəxsiyyət sərvətdir", "Müdriklik sərvətdir"* və s. ifadələrinə diqqəti çəkərkən akademik **İsa Həbibbəylinin** söylədiyi ***"Yaşar Qarayev özü də sərvətdir"* ifadəsi, fikrimizcə, bu mütəfəkkir alimin şəxsiyyətinə və fəaliyyətinə verilən yekun qiymətdir.** Doğrudan da, millətin ən böyük sərvətlərindən biri onun yetirdiyi insanlardır. Öz fəaliyyəti ilə tarixdə iz qoymuş, millətin, xalqın inkişafında konkret xidmətlər göstərmiş insanlar! Azərbaycan humanitariyası və estetik fikrində xüsusi yeri olan Yaşar Qarayev də məhz belə insanlar sırasındadır.

Yaşar Qarayev üslubu üçün səciyyəvi olan dil-üslub vahidlərindən biri də "**Yaddaş**" sözüdür. "***Ədəbiyyat filosofu***"nun "***Yaddaş konsepsiyası***"nın əks olunduğu "***Tarix: yaxından və uzaqdan***" əsəri elə bu anlayış əsasında sistemləşdirilmişdir.

Milli-mənəvi sərvətə çevrilmə Yaddaşda var olmanı şərtləndirən başlıca amildir. O, həm də mənəvi yaşarılığın qarantıdır. Deməli, milli-mənəvi sərvət hesab etdiyimiz Yaşar Qarayev konsepsiyasını təqdim etdiyi Yaddaşda özü də mövcuddur.

Yaşar Qarayev gərgin və gərəkli elmi fəaliyyətinin bəhrəsi olaraq filologiya elmləri doktoru, AMEA-nın müxbir üzvü, Dövlət mükafatı laureatı, Əməkdar Elm Xadimi, professor kimi elmi ad, dərəcə, vəzifə, mükafat və s. qazandı. **Lakin "Yaşar Qarayev" imzası bunların hamısının fövqündə dayandı. Deməli, məqsəd heç də elmi dərəcə almaq yox, sözün həqiqi mənasında Alim və Vətəndaş olmaqdır!**

**Örnəyi Yaşar Qarayev timsalında!**

*Kulis.az*



**Vaqif ASLAN,**
*Azərbaycan Yazıçılar Birliyi Şəki bölməsinin sədri, ADPU Şəki filialının baş müəllimi*

# Türk xalqları ədəbiyyatı

## Mühazirələr

*(Əvvəli ötən saylarımızda)*

### V. Zərb-məsəllər:

Yeri gəldikcə Kaşğari hadisə ilə bağlı zərb-məsəllər də çəkir.Məzmun və semantika baxımından bu məsəllər çox maraqlıdır.

| "Divan" variantı: | Azərbaycan variantı: |
|---|---|
| **1.** Sakak oxşar,sakal kəsər. (Bax. 4/12, s.286.; 7/16, s.282. 9/31, s.56.) | **1.** Çənə oxşar,saqqal kəsər. **1ª**. Çənəsini oxşar,saqqalını kəsər. **1ᵇ**. Başını kəsib saqqalını oynadır. **1ᶜ**. Başını kəsib saqqalını darayır. |
| **2.** Söküşüb uruşur, otra ton titişur. (Bax. 4/12, s.89.; 7/16, s.122.; 9/31, s.64.) | **2.** Söyüşərək vuruşur, arada (don) paltar didilir. |
| **3.** İkki boğra igeşür,otra kökegün yançılır. (Bax. 4/12, s.286.; 7/16, s.282. 9/31, s.56.) | **1.** İki buğra icəşir, arada köşək əzilir. **1ª**. Böyüklər boğuşanda qapaz kiçiyə dəyər. **1ᵇ**. Boğuşanlar boğuşar, qapaz aralayana dəyər. |

### VI. Deyimlər:

Deyimlər də məsəllər kimi hər hansı bir hadisə ilə bağlı olaraq yerində və məqamında işlənən sözlərdir.Onlar da təfəkkür tərzimiz ilə üst-üstə düşür.

| "Divan" variantı: | Azərbaycan variantı: |
|---|---|
| **1.** Oğlanığ yel kapdı. (Bax. 14/2, s.4.; 7/16, s.34.; 9/31, s.66.) | **3.**Uşağı yel qapdı. |
| **2.** Avcı ne kadar al bilerse, ayı da o kadar yol bilir. (Bax. 3/11, s.63.; 6/15, s.132-133.; 9/31, s.65.) | Ovçu nə qədər hiylə bilirsə, ayı da o qədər yol bilir. |
| **3.** Tilkümü toqdı azu börimi? (Bax. 3/11, s.429.; 6/15, s.423.; 9/31, s.65.) | **1.** Tülkümü doğdu, yoxsa börümü? **1ª**.Tülkümü doğdu, yoxsa qurdmu? |

Besim Atalay isə bunu belə izah edir: "Qızmı doğdu, yoksa oğlanmı? Qıza aldatdığı və yaltaqlandığı üçün "tülkü deyilir", oğlana igidliyinə görə "qurd"deyilir." Bizlərdə işlənən "Qız uşağı şeytan olar" məsəlinə diqqət et.

Qeyd edək ki,Azərbaycan təfəkküründə tülküyə münasibət ikilidir. Şəkidə hələ də yaşayan belə bir adət vardır. Dolu yağanda evin ilk uşağına məsləhət görürlər ki, dolunu dişləsin və desin: "Atamın-anamın ilkiyəm, ağzı qara tülkiyəm". Bu sözləri həm oğlan,həm də qız deyir. M.Kaşğaridə "qız" sözünün "tülkü" sözü ilə ifadəsi qıza və qadına mənfi münasibətdən deyil, qədim təfəkkür tərzimizdən irəli gəlir. Kişi təbiətindəki sərtlik,döyüşkənlik əsas götürüldüyü üçündür ki, Kaşğaridə "oğlan" sözü "börü" sözü ilə əvəz olunur. Çünki "Qurd oğlu qurd", "Ac qurd kimi yemək","Yapışdığı yeri qurd kimi sökmək" kimi deyimlərdəki semantika tarixi türk semantikasıdır.

### VII. Mövsüm nəğmələri: fəsillərin deyişməsi.

Çox təəssüf olsun ki,belə nümunələrin sayı Kaşğaridə azdır.

| "Divan" variantı: | Azərbaycan variantı: |
|---|---|
| **I. Qış deyir:** | |
| Sende kopar çadhanlar | Səndən qopar çayanlar, |
| Kudhçu sinğek yılanlar | Çibin, sinək, ilanlar. |
| Dük minğ kayu temenler | Quyruğunu iynə tək |
| Kudhruk tikip yügrüşür. | Dik tutub gəzər onlar. |
| (Bax. 5/13, s.367.; 8/17, s.318.; 9/31, s.66.) | |
| **II. Yaz deyir:** | |
| Senden kaçar sundılaç | Səndən qaçar böcək , quş. |
| Mende tınar kargılaç | Məndə dinər qaranquş. |
| Tatlığ öter sanduvaç | Bülbülü də oxudar |
| Erkek tişi uşruşur | Erkəkli - dişili uçuş. |
| (Bax. 5/13, s.178.; 8/17, s.174.; 39/1, s.66.) | |

### VIII. Təqvim - sınamalar.

Kaşğari gösərir ki,oğuzlar illərə heyvanların adlarını vermişlər. Kaşğaridə sıralanma belədir:

| "Divan" variantı: | Karaim(müqayisə üçün) təqvimi: | Azərbaycan variantı: |
|---|---|---|
| **1.** Ud yılı | **1.** Sıçkan yılı | **1.** öküz ili |
| **2.** Pars yılı | **2.** Sıqır yılı (öküz, sığır) | **2.** pişik ili |
| **3.** Tavışqan yılı | **3.** Pars yılı. | **3.** dovşan ili |
| **4.** Nek yılı | **4.** Kıoyan yılı (dovşan) | **4.** timsah ili |
| **5.** Yılan yılı | **5.** Uluv yılı (əjdəha) | **5.** ilan ili |
| **6.** Yund yılı | **6.** Yılan yılı | **6.** at ili |
| **7.** Koy yılı | **7.** Yılkıı (ilxı) | **7.** qoyun ili |
| **8.** Biçin yılı | **8.** Kıoyun yılı (qoyun) | **8.** meymun ili |
| **9.** Takaqu yılı | **9.** Meçi yılı (meymun) | **9.** toyuq ili |
| **10.** İt yılı | **10.** Tavuk yılı | **10.** it ili |
| **11.** Tonğuz yılı | **11.** İt yılı | **11.** donuz ili |
| **12.** Sıçğan yılı | **12.** kıaban yılı | **12.** siçan ili |
| (Bax. 3/11, s.346.; 6/15, s.354-355.; 9/31, s.67.) | | |

Hal-hazırda pars ili-pələng ili kimi, timsah ili-əjdaha ili kimi, toyuq ili-xoruz ili kimi təqdim olunur. Burada mənim təqdim etdiyim karaim təqvimi daha geniş müqayisə üçün imkan yaradır.

M.Kaşğari təkcə illərin adlarını sadalanmaqla qurtarmır, həm də bu illərə bağlı sınamalar və fallardan söz açır. Göstərir ki, illərə bağlı fal tutmalar türklərdə bir adətdir. Bu inanclar illərin sınaqlarından keçmişdir və bu xüsusiyyətlər heyvanların xarakterində də özünü göstərir.

*Türklər bu illərin hər birində bir hikmət var sanaraq onunla fal tutarlar, uğur sayarlar.* **Məs:** *Öküz ili girdikdə münaqişə, savaş çoxalırmış. Çünki öküzlər bir-biriləriylə vuruşurlar.*

*Toyuq ilində yeyəcək çox olur, ancaq insanlar arasında qarışıqlıq çoxalırmış.* Çünki toyuğun yemi dəndir, dəni tapmaq üçün çöplər, qırıntılar bir-birinə qarışdırılır.

*Timsah ili girdikdə yağış çox yağar, bolluq olurmuş.* Çünki timsah suda yaşayır.

*Donuz ili girəndə qar və soyuq çox olur.* Beləliklə, türklər hər il bir şey olacağına inanırlar. Türklərdə həftənin yeddi gününün adı çoxdur, çünki həftə deyilən şey islamlıqdan sonra bilinmişdir.

Köçəri və müsəlman olmayan türklər ili dörd yerə (dörd fəslə - V.A.) bölərək ad vermişdilər. Hər üç ayın bir adı var idı: I. "Oğlaq ay (ı)" deyildikdə "mart, aprel, may", II. "Ulu oğlaq ay (ı)" deyildikdə "iyun, iyul, avqust", III. "Uluğ ay" deyildikdə "sentyabr, oktyabr, noyabr" ayları başa düşülürdü. Dördüncü aya (fəslə - V.A.) gəldikdə isə Kaşğari zara-fatyana bir şəkildə yazır: *"Az kullanıldığı için ö bir adı söylemiyorum, sen anla."* (Bax. 11, s.348.; 15, s.356.; 31, s.68.) Dördüncünün "qış" olduğu və "dekabr, yanvar, fevral" aylarını əhatə etdiyi aydındır. Bizlərdə ilin ümumiyyətlə iki fəslə - yaza və qışa bölünməsi, *"ilk bahar", "son bahar"* kimi mövsüm bildirən terminlərin indi də dilimizdə işlənməsi yuxarıdakı fikri bir daha təsdiq edir.

M.Kaşğari: "Yeni gündən (Novruz) sonra ilkbahara "oğlaq ay", sonra "uluq oğlaq ay"deyərlər, çünki bu artıq yazdır. Yer üzündə nemət bollanır. Heyvanlar böyüyür, süd çoxalır"-deməklə izahatını daha da genişləndirir.

Bizim Novruz nəğmələrində tez-tez təkrar olunan ***"Mart gözünə barmağım, çıxdı yaza oğlağım"*** misralarındakı mənanı iki cür qəbul etmək mümkündür: Oğlağın (çəpişin) yaza çıxması və oğlaq ayının başlanması. (Bax. 3/11, s.346-347.; 6/15, s.356.; 9/31, s.68.)

### IX. İnanclar.

**İnanclar "Divanü Lüğat-it-Türk"də say etibarı ilə çox deyildir, lakin dəyərli saydığım üçün onları da təqdim etməyi zəruri bilirəm.**

**I. İsrık.**

Uşaqları pərilərə və göz toxunmasına (dəyməsinə) qarşı əfsunlayan zaman söylənir. Uşağın üzünə tüstü verilərək "ısrıq-ısrıq" deyilir ki, mənası "ey pəri, getmiş olasan" deməkdir. (Bax.3/11,s.99.;6/15,s.163.;9/31,s.69.)

**II. Qaş - ağ daş.**

Ağ daşı üzük qaşına qoyarlar. Bununla şimşəkdən, susuzluqdan və ildırım düşməsindən qorunurlar. (Bax. 5/13, s.152.; 8/17, s.153.; 9/ 31, s.69.) Buradan belə bir nəticəyə gəlmək olur ki, üzüklərə qoyulan qaşlar təkcə bəzək üçün deyildir, həm də daşa inamla, daşa etiqadla bağlıdır.

### X. Uşaq oyunları.

***.** "Er topıknı adhrı bilə tuldu." Kaşğarinin "Er topıknı adhrı bile buldı - **"Ər topunu dəyənəyi ilə vurdu"** (Bax. 4/12, s.22.; 7/16, s.50.; 9/31, s.69.) adı ilə təqdim etdiyi oyun bizlərdə uşaqların oynadığı **"Yalağa salma"** oyununa bənzəyir. Kaşğari oyunun gedişini belə təsvir edir: *"Kim topu daha qüvvətli vursa, oyuna birinci o başlayır. O, topu ikidişlı, çəngəlli dəyənəyi ilə oyuna daxil edir və bu qayda ilə oyun başlanır. Çiling-ağac oynunda da qayda belədir."* Kaşqarinin verdiyi izahat elə bu qədərdir. .

Bizlərdə isə bu oyun bu qayda ilə davam edir. Deməli, beş-altı uşaq qarşılarında kiçik çala düzəldib əllərində başı tompal dəyənəklə dururlar. Topu birinci vuran şəxs istəyər ki,vurduğu topu qarşısındakılardan birisinin çalasına salsın. Oyunçunun vəzifəsi odur ki, buna imkan verməsin. Üzərinə gələn topu çalışıb başqa birisinin çalasına salsın. Adətən, belə topları əski parçalarından yumrulayıb düzəldirlər.

****. "Munquz - munquz".** Divanda haqqında məlumat verilən ikinci uşaq oyunu **"Münğüz-münğüz" - "Buynuz-buynuz"** (Bax. 5/13, s.363-364.; 8/17, s.316.; 9/31, s.69.) oyunudur. Kaşğarinin təsvirinə görə uşaqlar çayın kənarında diz çökərək otururlar, ayaqlarının arasına yaş qum doldururlar, sonra əlləriylə quma vururlar oyunu aparan uşaq **"ebe"** adlanırmış və ayaq üstə duraraq deyirmiş: *"Buynuz, buynuz."* O biri uşaqlar isə soruşurmuş: *"Nə buynuzu?"* Ebe cavab verirmiş: *"İnək buynuzu.* (Bu da şərtidir. Birinci olaraq hər hansı bir heyvanın adını çəkmək mümkündür) Oyunda iştirak eləyən uşaqlar da ebenin dediklərini təkrar edərmişlər. Oyun qızışdıqca Ebe qəsdən buynuzu olmayan bir heyvanın adını çəkir. Uşaqlardan hansı birisə diqqətsizlik edərək buynuzsuz heyvanın adını təkrar edirsə uduzmuş hesab olunur. O, çaya atılıb çimməlidir.

*****. Yalnğu.**

Kaşğarinin təsvirinə görə bu oyun xidmətçilər tərəfindən icra olunurmuş. Bu oyunun qaydasına görə ipin iki ucu bir ağaca və ya bir tirə bağlanırmış, ipin ortasında oturan xidmətçi ayaqları ilə yerə vurur, beləliklə gah yüksəlir, gah alçalır - əslində yellənir. (Bax. 5/13, s.380.; 8/17, s.330.;9/ 31, s.70.) Bu bizlərdə indi də qalmaqda olan "yelləncək və ya sulanqaç" oynuna bənzər bir oyundur. Buradakı xidmətçi sözünü hərbçi adam mənasında da başa düşmək olar. Ona görə ki, Kaşğari dövründə elitar təbəqə hərbi işlə məşğul idi. Bizim nağıl və dastanlarımızda uşaqlara hərbi oyunların öyrədilməsi ilə bağlı epizodlar çoxdur. Hal-hazırda sulanqaç adi məişət oyunlarından biri hesab edilir. Kaşğarinin işlətdiyi xidmətçi sözündə qeyri-adi bir şey yoxdur.

### XI.Oğuz mətbəxi.

***. Uqut.**

Kaşğarinin əsərlərində bir sıra içki və yemək adları çəkilir. Onlardan biri də **"Uqut"**dur. (Bax. 3/11, s.50.; 6/15, s.123.; 9/31, s.70.) "Uqut" xəmir adıdır. Ondan içki düzəldilir. Deməli bir çox mə`mulatlar bir araya toplanaraq isladılır, arpa unu ilə qarışdırılır. Əmələ gələn xəmir fındıq böyüklüyündə kəsilir və yumrulanıb qurudulur.

*(Ardı var)*

# TƏHSİL - MİLLİ TƏRƏQQİ ÖLÇÜSÜDÜR

## I FƏSİL



**Həbibulla MANAFLI,**
*ADPU Şəki filialının baş müəllimi, tarixçi*

*(Əvvəli ötən sayımızda)*

**M.Ə.Rəsulzadə bir dostundan aldığı məlumat əsasında "İrşad" qəzetində çap etdirdiyi "Təəssüfli halətimiz" adlı məqalədə həmin mətləblə əlaqədar bunları yazırdı:** *"Amma müsəlmanlar isə axşamdan qumara oturub sübhi göz ilə görürlər. Oyun üstə bir-biri ilə höcətləşib, bəlkə də söyüşürlər. Evə qayıdanda bir-birindən kədərli, küsülü gedirlər. Millət dərdi bilməz, cəmət fikri çəkməz, zəmanə məsələsi qanmaz, klubu fəqət gəncəfəxanə[1] fəhm edib, işrət eviədd edirlər. Buna şahid olaraq bir nəfər rəfiqlərimdən mənə etdiyi söhbət atidə rəvayət olunur:*

*Kluba gedib oturdum ki, bir az qəzetdən, jurnaldan oxuyub kəsb ittila və mərifət edəm. Çar[2] ərtafımda rus, erməni və qeyri xaricə qəzetləri gördüm. Amma müsəlman şəhərinin klubunda bir yerdə ki, üzvlərin bir hissəsi müsəlmandırlar, özgə yerdə çıxan öylə dursun, şəhərimizdə intişar olunan qəzetlərin heç birini görməyib, nəhayət təəccüb və heyrət ilə pişxidməti çağırıb sual elədim: - Niyə müsəlman qəzetləri yoxdur? Cavab verdi:*

*- Əzizim, bu barədə Sizin müsəlmanlarınız özləri müqəssirdirlər, ona görə ki, elamnamə verib tələb etmiyorlar: ancaq gəlib yalxu keyf etmək, ləhvə məşğul olmaqdan başqa qeyri bir şey bilmiyorlar. Budur bizim tək bir nəfər polyak üzvümüz var. Məhz onun xahişinə görə bir ədaa polyak qəzetəsi alırız, sizin müsəlmanlar istəməyən halda bizə nə sərfədir ki, bica yerə pulumuzu xərc edək. Rəfiqim diyor:*

*- Gördüm ki, sözü haqdır, dəxi ona bir söz deməyib hazırda olan müsəlman üzvlərdən birinə bu xüsusda şikayət edib nə üçün tələb etməmələrini soranda mənə təsəlli verib dedi ki, "bu barədə inşallah bir məsləhət edəcəyiz...". Heyhat, heyhat! Bir adamın tələbi ilə başa gələn şeylərin xüsusunda məsləhət gözləyib, ümumiyyətlə görülməli olan məsələnin həllini bir nəfərə ricu etmək haləti biz müsəlmanlardan görəsən, nə vaxt zail olacaq?!"*

M.Ə.Rəsulzadədən gətirdiyimiz yuxarıdakı iqtibasdan göründüyü kimi Azərbaycan əhalisinin əhəmiyyətli hissəsi oxumağa, öyrənməyə, məlumat sahibi olmağa həvəs göstərməyib, çağdaş sivilizasiyanın tələblərinə etinasızlıq sərgiləmişdir. Bu durumun tarixi səbəbi var idi. Uzun müddət müstəmləkə əsarəti altında yaşaması, milli diskriminasiya siyasətinə məruz qalması xalqımızı təhsilə, biliyə, elmə və mənəvi həyatın digər sahələrinə özgələşdirmişdi.

Bu durumdan çıxmaq üçün ayrı-ayrı şəxslərin göstərdiyi cəhdlər bir çox hallarda istənilən nəticəni vermirdi. İnsanın oxumağa, öyrənməyə, anlamağa təbii, ulu tələbini nəzərə alan N.Nərimanov 1895-ci ildə şəxsi vəsaiti hesabına Bakıda qiraətxana açmışdı. Lakin bu qiraətxana cəmiyyət tərəfindən biganə münasibətə tuş gəldiyindən qısa müddətdən sonra öz fəaliyyətini dayandırmalı oldu. Bu hadisədən 11 il sonra "Nicat" xeyriyyə cəmiyyəti yenidən qiraətxana təsis etmişdir.

**M.Ə.Rəsulzadə bu gerçək tarixi faktı xatırladaraq yazırdı:** *"Hörmətli qarelər[3]! Yuxarıda zikr etdiyimi nəzərə alaraq xəyal edə bilərsiniz ki, Badkubə qiraətxanə üzü görmüyüb əvvəlinci dəfə olaraq "Nicat" qiraətxaneyi -islamiyyəsini görmüşdür. Yox, əzizim qare, belə güman etsək nəbəkbəharamlıq etmiş oluruz. 11 il bundan əqdəm millətimiz uğrunda şayani-təhsini-təşəbbüsdə bulunan ədəbiyyat xadimi Nəriman bəy Nərimanov Rusiya istibdadının qüvvətli bir dövründə sərfi-məsai[4] edərək bir qiraətxana güşadına izin alıb hər bir tərəfdə nəşr olunan islam qəzetlərini havi bir qiraətxanə açmışdı. Lakin millət bağçasında yeni açmış bu qızılgül millətimizə ariz olan xəzan vasitəsilə tez soluxub bağlanması güşadinə müqabil olaraq millət dostların yaralı ürəyini xəraş etdi. Qiraətxanənin bağlanmasına səbəb nə oldu?*

*Buna səbəb bizim cəhalətimiz, bətalətimiz, mədəniyyətsizliyimiz, daha doğrusu hümmətsizliyimiz oldu...*

*...Ey mədəniyyətli, həmmiyyətli əhli-maarif yoldaşlarım! Sizdən xahiş budur ki, bu tövr mədəniyyət asarı olan təşəbbüsatda qayım durunuz, millətimizə rəhbər sizsiniz - rəhbərlik vəzifəsini ifayə hazırlaşınız! Hər dürlü-ümurixeyriyyəyə iqdam edib millətə xidmətdən usanmayınız.*

*Ey nicatçı qardaşlarımız! Bu xeyir işə iqdam etdiniz də sabit qədəm olunuz! Zəmanənin hər bir təərrüzatını sədd olaraq hümmət və qeyrət ilə çalışınız. Var olunuz! Sağ olunuz! Qardaşlar!*

*Ürəfalarımıza millətimizi tapşırdınız. İndi isə cəmaətimizə ruci edib diyoruz: Ey cəmaət, ey millət, ürəfalarla birləşməlisiniz, onlar bir xeyir işə iqdam edərlərsə, siz də onlara maddən yardım etməlisiniz! Hər kəs təkliyində hər dürlü qəzetələrin hamısını alıb oxumağa, hər qisim kitabları pul verib mütaliəyə qüdrəti olamaz. Amma qiraətxana vasitəsilə iki qəpikdən keçərək nə qədər oxumalı olsa mümkündür...*

*Həmin bu "Nicat"ın 11 il bundan müqəddəm şükuflənərək soluxmasına səbəb həmanən, cəmaətimizin bihümmətliyi olmadımı?!...*

*...Yaşasın maarif!*
*Var olsun əhli-maarif!"*



**Ötən əsrin əvvəllərində Bakıda müsəlman-qız məktəbi.**

Bəli, M.Ə.Rəsulzadə xalqımızın maariflənməsi üçün atılan hər bir addımı, hər bir əməli fəaliyyəti alqışlamış, ətalətin, cəhalətin daş qapılarını açıb maarifin saf havasını, gur işığını xalqa bəxş etmək niyyətinə düşən hər kəsi təqdir etmiş, həyatın bu vacib mənəvi tərəfinin əhəmiyyətini dərk etmək istəməyənlərə qovuq kimi boş qafa ilə yaşamağın həyat deyil, zillət olduğunu anlatmağa çalışmışdır.

Tarixi həqiqətlər nə qədər acı olsa da onları dilə almağın zəruliliyini, lüzumunu inkar etmək olmaz. Söhbət o həqiqətlərdən gedir ki, milli idrakın inkişaf prosesini ləngidən təhriflərin, yalanların önündə sipərə çevrilir, yeni nəsillərin tarixdə və çağdaş dönəmdə baş verən hadisələrə, proseslərə açıq gözlə baxmasına, başqa sözlə, bəsirət sərgiləməsinə və nəhayət tarixi şəxsiyyətləri ədalət meyarından dəyərləndirməsinə imkan verir.

Dəyərli oxucular! Əgər diqqət yetirdinizsə, M.Ə.Rəsulzadə ***"millətimiz uğrunda şayani-təhsini-təşəbbüsdə bulunan"*** ifadəsini ictimai-siyasi xadim N.Nərimanov haqqında yox, ***"ədəbiyyat xadimi"*** Nəriman bəy Nərimanov barədə 1906-cı ildə söyləyib.

Ədəbiyyat xadimi, yazıçı və maarifçi N.Nərimanov Azərbaycan mədəniyyət tarixində nə qədər müsbət, pozitiv rol oynamışsa, siyasətçi N.Nərimanov bir o qədər neqativ, milli maraqlarla uzlaşmayan, tam tərsinə, əkslik təşkil edən əməllərə yol verib.

M.Ə.Rəsulzadə birinci N.Nərimanovu öyüb, ikinci N.Nərimanovu isə istiqlalımızın ədüvv-canı, yəni düşməni kimi təqdim edib. Hər iki halda haqlı olub.

M.Ə.Rəsulzadə N.Nərimanovun "Bahadır və Sona" romanını iri həcmli, elmi tutumlu məqalə vasitəsilə yüksək səviyyədə təhlil etmiş, əsərin məziyyətlərini, müəlifin bədii istedadını yetərincə dəyərləndirmişdir. Öndər ədəbiyyatın funksiyası haqqında bədii söz ustası üçün vacib olan xarakterik cəhətlər barədə fikirlərini belə ifadə edib: *"Məncə ədəbiyyat, hələ onun hekayənəvislik qismi həyatı eynilə təsvir etməklə mükəlləfdir. Binaənəleyh öylə bir surətdə yaradılmalıdır ki, oxucularını alçaq hissiyyat və dəni rəftarlardan iyrəndirsin, yüksək fikirlər və ali hissiyyatlara, biləks imrəndinsin. Bunu bir ədib kamilən ifa edə bilmək üçün iki vergiyə malik olmalıdır: biri vüsəti-qərihə[5], o biri cəsarəti-mədəniyyə. Allah Nərimanova bunların ikisini də vermişdir. Ehtimal ki, bəzilərincə ikinci bir az da artıq hesab olunur. Fəqət, məncə kaş ki, pulları artıq düşənlər əvəzinə Allah bizə cəsarətimədəniyyələri çox olanlardan bollu-bollu ehsan edəydi."*

Deməli, M.Ə.Rəsulzadə "Bahadır və Sona" romanının müəllifində ədəbi istedadla yanaşı mədəni cəsarətin də olduğunu bildirib. Eyni zamanda "cəsarəti-mədəniyyə" anlayışının alt qatına nüfuz edərək, onun məna tutumunu şərh edib. Bu şərhdən məlum olur ki, əgər ədib arxaik adətənənələrin və sxolostik düşüncə tərzinin, bir sözlə, yazılmamış qanunların qəbul etmədiyi mövzulara toxunursa, ümumbəşəri məzmun kəsb edən məsələləri çözməyə cəhd edirsə, başqalarının qələmə almağa cürət etmədiyi mətləblərə baş vurursa "cəsarəti mədəniyyə", yəni mədəni cəsarət kimi yazıçı üçün son dərəcə vacib olan özəlliyə sahib çıxdığını təsdiq etmiş olur.

1913-cü ildə M.Ə.Rəsulzadə bir yazıçı kimi N.Nərimanova belə yüksək dəyər verib.

1920-ci ildə "Azərbaycan" qəzetində dərc olunmuş ***"Azərbaycan təşəkkülündə Müsavat"*** adlı məruzəsində isə onun haqqında yazırdı: *"Xatirimdədir, Bakı bələdiyyəsində hökumət təşkili məsələsi müzakirə olunuyordu. Müsavat naminə buranın hökuməti yerli xəlq əlində olmalıdır, dedigim zaman bütün firqələri, bilxassə Rusiyanı təmsil edən sol firqələri acıqlandırmışdım. O günə qədər bizimlə bir dərəcəyə qədər yola gedən məhəlli bolşeviklər o gündən etibarən başqa dürlü rəftar etməgə başlamışlardı.*

*Axır böylə idi. Fəqət yar az da vəfakar degildi. O zaman müsəlman sosialistlərin ələmdarı bulunan "Hümmət" firqəsi başda doktor Nəriman olmaq üzrə Azərbaycan müxtəriyyətinin ədüvv-canı idi. "Hümmət"ə görə biz milləti fəlakətə çəkiyor və mən qeyri həqq millət naminə söz söylüyormuşam. Azərbaycan fikri, türklük iddiaları xəlqin degil, bir taqım burjuapərəst "boşboğaz"ların imiş. Müsəlmanların mənfəəti "qırmızı əmək bayrağının" altına toplanmaq və "Rusiya demokratiyasından" ayrılmamaqda imiş.*

*İslamçıların nəzərində də biz həqsiz idik. O zamankı "Rusiyada müsəlmanlıq" bizi təriqətçilikdə, milləti-islamı parça-parça etməkdə ittiham ediyordu.*

*Fəqət biz bütün bu hücumlara, bütün bu ittihamlara rəğmən diyoruq: Yaşasın Azərbaycan!"*

N.Nərimanovun M.Ə.Rəsulzadə tərəfindən "muxtariyyət düşməni", başqa sözlə, istiqlal əleyhidarı ittihamına məriz qalmasının çeşidli səbəbləri var idi. Bu səbəblər 1917-1920-ci illərdə baş verən olayların məğzində, mahiyyətindədir. Necə deyərlər, hər şey göstərilən konkret zaman daxilindədir.

İdrak prosesi gerçəkliyin insan şüurunda məqsədyönlü inikasından ibarətdir. Bu fikir fəlsəfə elminin əsas müddəalarından biridir. Biliksizlikdən biliyə, az bilikdən çox biliyə doğru davam edən idrak prosesinin başlıca özəlliyi onun daimiliyində, sonsuzluğundadır. Bu qanunauyğunluqla yalnız anlamamaqdan fayda umanlar, yaxud "nə deyirsən de, qanmayım atan yansın" deyiminə aludə olanlar barışmaq istəmirlər.

M.Ə.Rəsulzadə tərəfindən N.Nərimanova ünvanlanan "istiqlal düşməni" ittihamının əsasında gerçək, təkzibedilməz tarixi faktlar durur. Bu dəlillər üçün heç də arxivlərə baş vurmağa ehtiyac yoxdur. Elə onun 1989-cu ildə işıq üzü görmüş seçilmiş əsərlərinin ikinci cildini nəzərdən keçirmək kifayətdir.

*(Ardı var)*

1 - **gəncəfəxanə** - *qumar kağızı evi;*
2 - **çar (çahar)** - *dörd tərəfimdə;*
3 - **qare** - *oxucu;*
4 - **məsai** - *çalışma, səy;*
5 - **qərihə** - *istedad, zəka.*




# DYP guşəsi

# Şəki Şəhər-Rayon Polis Şöbəsinin Dövlət Yol Polisi Bölməsi tərəfindən 2017-ci il ərzində görülmüş işlərə dair HESABAT

Azərbaycan Respublikasının Prezidenti, Cənab Ali Baş Komandan İlham Əliyevin apardığı uğurlu iqtisadi siyasətin nəticəsidir ki, respublikamıza xarici ölkələrdən idxal olunan nəqliyyat vasitələrinin sayı nəyinki ilbəil hətta, günbəgün çoxalmaqdadır. Avtomobillərin sayının artması respublikamızın avtomobil yollarında hərəkətin intensivliyinin yüksəlməsinə səbəb olmuşdur. Hərəkətin intensivliyi nə qədər yüksəldikcə yol-nəqliyyat hadisələrinin baş verməsi də bir o qədər labütdür. Lakin, buna baxmayaraq, Azərbaycan Respublikasının Daxili İşlər Nazirliyi, Nazirliyin Baş Dövlət Yol Polisi İdarəsi eləcə də, yerlərdəki müvafiq qurumlar yol-nəqliyyat hadisələrinin qarşısının alınması istiqamətində əməli, təşkilati və profilaktiki tədbirlər hazırlayıb həyata keçirirlər. Şəki Şəhər-Rayon Polis Şöbəsinin Dövlət Yol Polisi Bölməsi tərəfindən də 2017-ci il ərzində müəyyən işlər görülmüşdür. Belə ki, təhlillər aparılmış və müəyyən edilmişdir ki, ötən illər ərzində respublikamız ərazisində baş vermiş ağır yol-nəqliyyat hadisələri əsasən sürət məhdudiyyətinin aşılması, ötmə və manevretmə, qarşı hərəkət zolağına çıxma kimi kobud yol hərəkət qaydalarının pozulması nəticəsində baş vermişdir. Nəqliyyat vasitələrinin sərxoş vəziyyətdə, sürücülük hüququ olmadan idarə edilməsi, təhlükəsizlik kəmərlərindən istifadə etməmə kimi yol hərəkət qayda pozuntuları isə baş verən qəzalarda ağırlıq dərəcəsinin artmasına səbəb olmuşdur. Buna görə də, 2017-ci ildə Şəki Şəhər-Rayon Polis Şöbəsinin Dövlət Yol Polisi Bölməsi tərəfindən bütün qüvvə və vəsaitlər yol-nəqliyyat hadisələrinin baş verməsinə bilavasitə təsir göstərən yol hərəkəti qayda pozuntularının aşkarlanmasına yönəldilmişdir. Bundan əlavə, yol hərəkəti təhlükəsizliyinin təmin olunması, yol-nəqliyyat hadisələrinin qarşısının alınması istiqamətində tərəfimizdən təbliğat və maarifləndirmə işləri aparılmış, profilaktiki tədbirlər bir qədər də gücləndirmişdir. Xüsusi ilə də piyadaların intizamanının artırılması, küçə hərəkəti qaydalarının öyrədilməsi, təhlükəsiz davranış vərdişlərinin aşılanması məqsədi ilə təhsil müəssisələrində maarifləndirmə işlərinin aparılmasına önəm verilmişdir.

Azərbaycan Respublikası Daxili İşlər Nazirliyinin 05 dekabr 2014-cü il tarixli, 023 nömrəli əmri ilə elan edilmiş "Narkotik vasitələrin, psixotrop maddələrin və onların prekursorlarının qanunsuz dövriyyəsinə qarşı mübarizənin vəziyyəti" haqqında KQ-5/1 nömrəli Kollegiya Qərarının 8-ci bəndinin icrası ilə bağlı "Gənclər narkotiklərə yox deyir" hüquqi mövzuda azyaşlı və yeniyetmələrin milli vətənpərvərlik ruhunda tərbiyələndirilməsi və baxımsızlığının qarşısının alınması, maarifləndirilməsi istiqamətində rayonun digər aidiyyatı qurumları ilə birlikdə tədbirlər həyata keçirilmişdir.

2016-2017-ci və 2017-2018-ci tədris illərində Şəki ŞRPŞ-nin rəisi, polis polkovniki cənab Əbülfət Rzayevin göstərişi və nəzarəti altında tərtib edilmiş cədvəl üzrə həftədə 2 (iki) dəfədən az olmayaraq, 2017-ci ilin noyabr ayının 15-dən etibarən isə həftədə 4 (dörd) dəfədən az olmayaraq rayonun ümumtəhsil məktəblərində eləcə də, universitet və kolleclərdə "Gənclər narkomaniyaya yox deyir", "Dini radikalizmə qarşı mübarizə hər birimizin borcudur", "Erkən nikah və onun fəsadları", "Yol hərəkətinin təhlükəsizliyində piyadaların rolu" mövzularında keçirilən həmin tədbirlərdə iştirak edilmişdir.

Bu tədbirlər 2015-ci il ərzində 35, 2016-cı il ərzində 53, 2017-ci il ərzində isə 55 təhsil müəssisəsində keçirilmişdir.

Təhsil müəssisələrində aparılmış profilaktiki tədbirlər müsbət nəticəsini vermiş, xidməti ərazidə 2017-ci il ərzində piyadanın yol hərəkəti qaydasını pozması səbəbindən heç bir yol-nəqliyyat hadisəsi baş verməmişdir.



**Tural NİFTALIYEV,**
*Şəki Şəhər-Rayon Polis Şöbəsinin Dövlət Yol Polisi Bölməsinin Təbliğat və Təşviqat Üzrə İnspektoru, polis baş leytenantı*

Görülmüş bu və ya digər işlərin nəticəsində, 2017-ci il ərzində Şəki Şəhər-Rayon Polis Şöbəsinin Dövlət Yol Polisi Bölməsinin xidməti ərazisində ağır (ölüm və xəsarətlə nəticələnən) yol-nəqliyyat hadisələrinin sayının, eləcə də baş verən qəzalarda ağırlıq dərəcəsinin nəzərəçarpacaq dərəcədə aşağı salınmasına nail olunmuşdur. Belə ki, 2017-ci il ərzində 2016-cı il ilə müqayisədə ümumi yol-nəqliyyat hadisələrinin sayı 9 (doqquz) fakt, ölənlərin sayı 1 (bir) fakt, xəsarət alanların sayı isə 9 (doqquz) fakt azalmışdır.

Görülmüş bütün bu tədbirlər insanların həyat və sağlamlığının qorunmasına xidmət edir.

Şəki Şəhər-Rayon Polis Şöbəsinin Dövlət Yol Polisi Bölməsi gələcəkdə də, yol hərəkəti təhlükəsizliyinin təmin olunması, yol-nəqliyyat hadisələrinin qarşısının alınması istiqamətində tədbirləri davam etdirəcəkdir.

**Bütün hərəkət iştirak-çılarını, avtomobil qəzalarından uzaq düşmələri üçün yol hərəkəti qaydalarını bilməyə və onlara əməl etməyə çağırırıq.**



## ALLAH RƏHMƏT ELƏSİN

**Şəki Bələdiyyəsinin kollektivi,**
**bələdiyyənin ilk sədri**
**TEYMURXAN ZİYA OĞLUNUN**
vəfatından kədərləndiyini bildirir, onun ailəsinə və yaxınlarına və dərin hüznlə baş sağlığı verir.
**ALLAH RƏHMƏT ELƏSİN.**

Böyük Vətən Müharibəsi, Əmək, Hüquq-Mühafizə, Silahlı Qüvvələr Veteranları Şəki Təşkilatının sədri **Mustafa Əhmədov,** rayonumuzun veteranları adından **Nahid, Zahid, Xalid və Vüsaləyə, ataları**
**ŞAHİD MƏMMƏDKƏRİMOVUN**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə baş sağlığı verir.
**ALLAH RƏHMƏT ELƏSİN.**

**Şəki Bələdiyyəsinin kollektivi**, ADPU Şəki filialının professoru **Firədun İbrahimova, anası**
**NAZİLƏ XANIMIN**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə baş sağlığı verir.
**ALLAH RƏHMƏT ELƏSİN.**

**Şəki Bələdiyyəsinin kollektivi**, Böyük Vətən Müharibəsi, Əmək, Hüquq-Mühafizə, Silahlı Qüvvələr Veteranları Şəki Təşkilatının sədr müvini, şair-yazıçı
**ŞAHİD MƏMMƏDKƏRİMOVUN**
vəfatından kədərləndiyini bildirir və ailəsinə dərin hüznlə baş sağlığı verir.
**ALLAH RƏHMƏT ELƏSİN.**

**Şəki Bələdiyyəsinin kollektivi,** "Marxal" istirahət mərkəzinin baş mühəndisi **Şahin Əzizova, atası**
**HƏTƏM ƏZİZOVUN**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə baş sağlığı verir.
**ALLAH RƏHMƏT ELƏSİN.**

**Rafael Muradov, Murad Nəbibəyov, Əhəd Allahverdiyev,** dostları **İlham Hacıyevə, yaxın qohumu**
**VAQİF HƏMİDOVUN**
vəfatından kədərləndiklərini bildirir və dərin hüznlə baş sağlığı verirlər.
**ALLAH RƏHMƏT ELƏSİN.**

## ETİBARSIZ HESAB EDİLİR

Şəki rayonu, Aşağı Küngüt kənd sakini Cəfərov Məhərrəm Ərəstun oğlunun adına verilmiş buraxılış ili 1978 olan MTZ-50 markalı traktorun sənədləri, **Qeydiyyat Şəhadətnaməsi** itdiyi üçün etibarsız sayılır.

Şəki şəhəri, M.Abbasov (Pravda) küçəsi, 22 ünvanda **Səlimov Qaffar Kərim oğlunun** adına verilmiş 27.02.1932-ci il tarixli 1541 nömrəli **Torpaq qeydiyyat sənədi** itdiyi üçün etibarsız sayılır.

Şəki rayonu, Sarıca kənd sakini **Heydərəlizadə Nəzrin Azad qızının** adına verilmiş **Şəxsiyyət vəsiqəsi** itdiyi üçün etibarsız sayılır.

Şəki şəhəri, Calğalıbulaq küçəsi, ev 6 ünvanda yaşayan **Seydəliyev Qoşqar Mahir oğlunun** adına Tbilisi şəhərindəki "Geomed" Universiteteti tərəfindən 2016-cı ildə verilmiş **Diplom** itdiyi üçün etibarsız sayılır.

Şəki şəhəri, L.Abdullayev küçəsi, ev 20 ünvanda yaşayan **Novruzov Rauf Məcid oğlunun** adına verilmiş **Şəxsiyyət vəsiqəsi**, **Sürücülük vəsiqəsi** və **Sosial kart** itdiyi üçün etibarsız sayılır.

Şəki şəhəri, X.Səfərəliyev küçəsi, ev 6 ünvanda yaşayan **Məmmədova Səbinə Əlddin qızının** adına verilmiş Şəki pedaqoji Texnikumunun 03.07.2004-cü il tarixli **Diplomu**, **Əmək kitabçası**, **Dövlət Sosial Sığorta Şəhadətnaməsi**, **Nikahın bağlanması haqqında Şəhadətnamə**, **Doğum haqqında Şəhadətnamə** və oğlu **Fəttahlı Mirpənah Mirxalidin adına verilmiş Doğum haqqında Şəhadətnamə** itdiyi üçün etibarsız sayılır.




# ŞƏKİ BƏLƏDİYYƏSİ

№ 01 (159), Yanvar 2018






# "Tut ağacı"

**Bakıda Azərbaycanlı-gürcü şair Giya Paçxataşvilinin "Tut ağacı" kitabının təqdimatı olub.**

MİLLİYYƏTCƏ GÜRCÜ OLAN AZƏRBAYCAN ŞAİRİNİN **"TUT AĞACI"** KİTABININ TƏQDİMAT MƏRASİMİNDƏ ***"GİYA PAÇXATAŞVİLİ ADINA MULTİKULTURALİZM MÜKAFATI"***NIN TƏSİS OLUNMASI TƏŞƏBBÜSÜ İRƏLİ SÜRÜLÜB.




QİYA PAÇXATAŞVİLİ

Yanvarın 29-da Atatürk Mərkəzində şair-tərcüməçi Giya Paçxataşvilinin "Tut ağacı" kitabının "İmza günü" keçirildi. Milliyyətcə gürcü olan Azərbaycan şairinin əsasən mərhum həyat yoldaşı Lamara xanıma həsr etdiyi şeirlərdən ibarət kitabı "Vektor" Beynəlxalqü Nəşrlər Evi çap edib. Təqdimat mərasiminin baş tutduğu gün həmçinin müəllifin ad günü ilə əlamətdar olub.

Çıxış edənlərdən ədəbiyyatşünas alimlər **Nizami Cəfərov**, **Nizami Tağısoy**, **Qiymət Məhərrəmli**, rəssam **Rais Rəsulzadə *(Məhəmməd Əmin Rəsulzadənin nəvəsi)***, bədii qiraətçi **Eldost Bayram**, şair **İbrahim İlyaslı** və başqaları **Giya Paçxataşvilinin** yaradıcılığı, Azərbaycan ədəbiyyatında rolu barədə yüksək fikirlər söyləyib, şairin az öncə "Vektor" Beynəlxalq Elmlər Akademiyasının Şahmar Ələkbərzadə adına Ədəbiyyat mükafatına layiq görüldüyünü xatırladıblar. Tədbirdə şairin dostu jurnalist **Pünhan Şükür** xalqlar dostluğuna xidmət edən ədəbiyyat adamları üçün **"Giya Paçxataşvili adına multikulturalizm mükafatı"**nın təsis olunması təşəbbüsü irəli sürüb.

**Şəki Bələdiyyəsinin kollektivi Giya Paçxataşvilini təbik edir, ona can sağlığı və daha böyük yaradıcılıq uğurları arzulayır.**

* * *

## Azərbaycan bayrağı

Giya Paçxataşvili

*Bir əsrlik yol gələn,*
*Enməməkçün yüksələn,*
*Düşmən gözləri dələn*
*Rəsulzadə çırağı -*
*Azərbaycan bayrağı!*

*Səmadan enmiş Quran,*
*Azadlıq tamlı dövran,*
*Şəhidin verdiyi qan,*
*Qonaqpərvər torpağım -*
*Azərbaycan bayrağı!*

*Pak amal fəlsəfəsi,*
*Hürriyyətin gur səsi,*
*Sönməz günəş şöləsi,*
*Qələbələr sorağı -*
*Azərbaycan bayrağı!*

*Bəzəyir göyü, yeri*
*Vətənpərvərlər piri,*
*Zamanın ürək şeiri,*
*Həqiqətin yarağı -*
*Azərbaycan bayrağı,*
*Azərbaycan bayrağı!*

**M.NƏBİBƏYOV**



## Şəhidlər

Gülnarə NƏSİBOVA

*O qara kölgələr bizə gələndə,*
*20 yanvarda ölsəydim mən də,*
*Qanlı faciəni bilməzdim onda,*
*Görməzdim yurdumu qara bir donda.*

*Vaxtsız vəfat edən qardaşım, bacım,*
*Sizi düşünürəm tökülür saçım.*
*Məğrur duruşunuz düşür yadıma,*
*Bu vaxt ağlamağım çatır dadıma.*

*Ağlayıram qəmli ürəyim ilə,*
*Əllərim qalxmayır gözümü silə.*
*Mən nalə çəkəni şəhidlər bilə,*
*Bəlkə göz yaşımı özləri silə.*

*Sizin üçün xəyala dalıram hərdən,*
*Bircə xahişim var şəhidlər, sizdən:*
*Ölüm hələ tezdi - qalxın, dirçəlin,*
*Torpağın altından çıxın, cücərin.*

*Cücərin yurdumun laləsi kimi,*
*Ətirli zanbağı, nərgizi kimi.*
*Ruhunuz qızılgül ətirli olsun,*
*Sizi yad eləmək bizə borc olsun.*

## Cənub həsrəti

Musa HƏŞİMOV

*İstədim yön tutum günəyə sarı,*
*Gördüm ki, yoluma sədd çəkibdilər.*
*Bu səddi dağıtmaq, qırmaq istədim,*
*Sən demə poladdan bərk çəkibdilər.*

*Əlimdə qırıldı külüngün sapı,*
*Üzümə bağlandı, qapandı qapı.*
*Əlimi yandırdı baltanın sapı,*
*Ömrümə, günümə dərd əkibdilər.*

*Vətənim bir parça ötə tay olub,*
*Bölüblər ikiyə yada pay olub.*
*Xan Araz kədərli axan çay olub,*
*Sinəmin üstünə dağ şəkibdilər.*

## ELAN

**ƏZİZ OXUCULARIMIZ!**
**Tezliklə "ŞƏKİ BƏLƏDİYYƏSİ" qəzetinə 2018-ci il üçün abunə kampaniyası davam edir.**

***Qəzetimizə abunə olmaq üçün Şəki Regional Poçt Şöbəsinə, "Azərmətbuatyayım" ASC-nin və "QAYA" mətbuatyayımın Şəki Şöbələrinə müraciət edə bilərsiniz.***


Qəzetin hazırlanmasında Şəki Şəhər İcra Hakimiyyətinin *sheki-ih.gov.az* və AZƏRTAC-ın *azertag.gov-az* saytlarından istifadə olunmuşdur.

*Redaksiyaya təqdim olunan əlyazmaları, disklər, fotolar və digər materiallar geri qaytarılmır.*

Müəlliflərin mövqeyi ilə redaksiyanın mövqeyi üst-üstə düşməyə bilər. Dərc olunmuş yazılara görə müəlliflər və məlumatın götürüldüyü mənbə məsuliyyət daşıyır.



Təsisçi: Şəki Bələdiyyəsi

Baş redaktor: Murad Nəbibəyov

**Redaksiyanın ünvanı:** Şəki şəhəri, AZ5500, M.Ə.Rəsulzadə pr.182, 2-ci mərtəbə
**Tel:** +(994 24) 244 00 51, +(994 24) 244 28 02
**E-mail:** sheki.belediyye@gmail.com

**Hesab nömrəsi:**
Azərbaycan Beynəlxalq Bankının Şəki filialı,
Kod: 805410
VÖEN: 9900001881
Müxbir hesabı: 0137010002944
S.W.İ.F.T. BİK İBAZAZ 2X
Şəki Bələdiyyəsi,
Hesab №: 33308019449336503266
VÖEN 3000086531

Qəzet 27 iyul 2005-ci ildə Azərbaycan Respublikası Ədliyyə Nazirliyində qeydiyyatdan keçib.
**Qeydiyyat № 1458.**
**Tiraj 500.**
Çapa hazırlanıb: 12 fevral 2018-ci il
Qəzet "AZƏRMEDİA" MMC mətbəəsində çap olunub.

www.municipality.sheki.city